**AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790–0738 (Print) | ISSN 2791–0911 (Online) | ISSN-L 2790–0738

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli əmri ilə Nizamnaməsi təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436 | Qeydiyyat № B236

"Azərbaycan dili və ədəbiyyat tədrisi" dilçilik və ədəbiyyatşünaslıq sahələrində Azərbaycan, türk, ingilis və rus dillərində elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatının (həmçinin xarici ədəbiyyatın) tədqiqi və təbliği məsələlərini araşdıran, tədris metodikasını, müasir tədris yanaşmalarını təbliğ edən və bu sahələrdəki yenilikləri işıqlandıran resenziyalı, açıq girişli elmi-metodik nəşrdir. Jurnal il ərzində dörd dəfə Creative Commons Attribution-NonCommercial 4.0 (CC BY-NC 4.0) lisenziyasının şərtləri əsasında yayımlanır və çap edilir. Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasına daxildir.

---

**TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790–0738 (Print) | ISSN 2791–0911 (Online) | ISSN-L 2790–0738

The Charter of the Ministry of Education of the Republic of Azerbaijan was approved by the order dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436 | Registration № B236

"Teaching of Azerbaijani Language and Literature" is a peer-reviewed, Open-Access scientific and methodological journal that publishes scientific articles in the fields of linguistics and literary studies in Azerbaijani, Turkish, English and Russian, preserves the purity and functionality of our language, investigates the issues of research and promotion of the Azerbaijani language and literature (as well as foreign literature), promotes teaching methodology, modern teaching approaches and highlights innovations in these fields. The journal is published and printed four times a year under the terms of the Creative Commons Attribution-NonCommercial 4.0 (CC BY-NC 4.0) license. It is included in the list of periodical scientific publications recommended by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan.

## İÇİNDƏKİLƏR

**Cild 71 Say 1 / 2025**

# CONTENTS

## Volume 71 Issue 1 / 2025




*Hörmətli oxucular!*

*“Azərbaycan dili və ədəbiyyat tədrisi” jurnalının 2025-ci ilin ilk sayını təqdim etməkdən məmnunluq duyuruq. Bu buraxılış yenilənmiş dizaynı ilə oxucuların diqqətinə təqdim olunur.*

*Jurnalımız elmi biliklərin inkişafına töhfə verməyi daim ön planda tutur. Bu məqsədlə, jurnalın məzmununu müasir akademik standartlara uyğun olaraq təkmilləşdirir və elmi araşdırmalara verdiyimiz dəstəyi davam etdiririk.*

*Jurnalımızın beynəlxalq elmi bazalarda indekslənməsi istiqamətindəki fəaliyyətləri davam edir və daha əhəmiyyətli beynəlxalq platformalarda təmsil olunmaq məqsədilə müvafiq tədbirlər görülür. Bu, jurnalın elmi nüfuzunun artırılmasına və tədqiqatçıların elmi araşdırmalarının beynəlxalq akademik mühitə təqdim edilməsinə xidmət edir.*

*Yeni sayın elmi ictimaiyyət üçün faydalı olacağına ümid edir, məqalələri ilə jurnalımızın inkişafına töhfə verən müəlliflərimizə və oxucularımıza təşəkkür edirik.*

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 13–18
https://doi.org/10.48445/f9646-0590-9052-d

# Söz-cümlə ilə yarımçıq cümlələrin sintaktik-semantik xüsusiyyətlərinin müqayisəsi

***Ədalət Abbasov*** [1]

**XÜLASƏ**
*Yarımçıq cümlələr üzvlənən cümlələr sisteminə aid olub, bütün cümlə üzvləri ilə ifadə edilə bilir. Yarımçıq cümlələrə aid olan koordinasiyaları dəqiq müəyyənləşdirmək məqsədilə onların söz-cümlə ilə müqayisəsi xüsusilə əhəmiyyətlidir. Bu iki cümlə tipi struktur-semantik cəhətdən zahirən sinonimik təsir bağışlayır. Çünki hər ikisi kommunikativ forma baxımından dialoji quruluşa malikdir. Yarımçıq cümlələrdə fikrin ifadəsində iştirak edən üzvlərdən biri və ya hər ikisi buraxılır. Əgər təktərkibli və ya cüttərkibli müxtəsər və geniş cümlə üzvlərindən biri və ya bir neçəsi buraxılıbsa və bu üzvlər asanlıqla bərpa edilə bilirsə, belə cümlələr yarımçıq cümlələr adlandırılır. Söz-cümlə isə üzvlərə ayrılmayan, yəni üzvlənməyən sadə cümlə qrupuna aiddir. Yarımçıq cümlələrdə buraxılan üzvlər mətndəki kontekstə əsasən bərpa edilə bilir. Lakin söz-cümlədə bu mümkün deyil, çünki burada ilkin fikrə münasibət ifadə edildiyinə görə buna ehtiyac qalmır. Ümumiyyətlə, əlaqəli nitqdə məzmunca yarımçıqlıq olmamalıdır; bu yarımçıqlıq onun müstəqil işlədilə bilən bütöv variantlarına nisbətən yalnız formada müşahidə olunur. Bu fərqliliklərin dərk edilməsi dilin istifadə qaydalarının daha dərindən qavranılmasına kömək edir.*

**AÇAR SÖZLƏR**
*sintaktik-semantik xüsusiyyət, nitq mühiti, kommunikativ funksiya, üzvlənən cümlə, üslubi cəhət, kontekstual situasiya*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 26.12.2024
Qəbul edilib: 27.02.2025

[1] Filologiya elmləri doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
https://orcid.org/0000-0002-9704-1874 | abbasov-edalat@mail.ru

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 1 / 13–18
https://doi.org/10.48445/f9646-0590-9052-d

# Comparison of Syntactic-Semantic Features of Sentences and Incomplete Sentences

***Adalat Abbasov*** [1]

**ABSTRACT**
*Incomplete sentences belong to the system of participle sentences and can be expressed by all sentence members. It is especially useful to compare them with a sentence in order to determine precisely the coordinations that belong to incomplete sentences. These two sentence types have an apparently synonymous effect from a structural-semantic point of view. Because both sentence types have a dialogic structure in terms of communicative form. In incomplete sentences, one or both members involved in the expression of the idea are omitted. If one or more members of a single or double short and long sentence are omitted and these members can be easily restored, such sentences are called incomplete sentences. The word refers to a group of simple sentences that are not divided into members, that is, they are not members. Missing members in incomplete sentences can be recovered based on the context in the text. However, this is not possible in the sentence, because there is no need for it because the attitude to the original idea is expressed here. In general, connected speech should not be incomplete in content; this incompleteness is observed only in the form compared to its whole variants that can be used independently. Understanding these differences contributes to a deeper understanding of language usage.*

**KEYWORDS**
*syntactic-semantic feature, speech environment, communicative function, member sentence, stylistic aspect, contextual situation*

**ARTICLE HISTORY**
Received: 26.12.2024
Accepted: 27.02.2025

---

[1] Doctor of Philological Sciences, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan.
https://orcid.org/0000-0002-9704-1874 | abbasov-edalat@mail.ru

 

## Giriş

Problemin həlli üçün söz-cümlə ilə yarımçıq cümlənin müqayisəli tədqiqindən başlamaq daha məqsədəuyğundur.

**Oxşar cəhətləri:**

1) Hər ikisi mövqeyinə görə bir-birinə yaxındır. Yəni işləndiyi nitq mühiti və şəraiti baxımdan eynidir. Məsələn:

1. – *Deyəsən, taksi gəlib. Taksini kim çağırıb ki?*
   – *Mən.*
   – *Sağlıqla qalın.*
   – *Sizə minnətdaram.*
   – *Mən də.*
2. – *Hamısını yoxlamaq lazım gələcək.*
   – *Eviniz qarajdan çox uzaqdadır?*
   – *Hə.*
   – *Eviniz çox böyükdür?*
   – *Yox.*
   – *Sizdə zirzəmi də var?*
   – *Bəli.*

2) Hər iki cümlə strukturunda kommunikativ funksiya dialoji nitq şəraitində baş verir.

3) Hər ikisində tələb edilən cavab kəmiyyətcə tək-tək sözlərlə ifadə edilir.

4) Həm yarımçıq cümlə, həm də söz-cümlə kontekstdən kənarda heç bir məna (fikir) ifadə etmir.

Lakin belə yaxın əlaqələrinin olmasına baxmayaraq, bu iki sadə cümlə strukturu arasında fərqli xüsusiyyətlər mövcuddur.

Yarımçıq cümlələr üzvlənən cümlələr sisteminə aid olub, bütün cümlə üzvləri ilə ifadə edilə bilir. Yarımçıq cümlələrə aid olan koordinasiyaları dəqiq müəyyənləşdirmək məqsədilə onların söz-cümlə ilə müqayisəsi xüsusilə əhəmiyyətlidir. Bu iki cümlə tipi struktur-semantik cəhətdən zahirən sinonimik təsir bağışlayır, çünki hər ikisi kommunikativ forma baxımından dialoji quruluşa malikdir.

## Əsas hissə

Təktərkibli və ya cüttərkibli, müxtəsər və geniş cümlə tiplərinin üzvlərindən biri və ya bir neçəsi buraxılmışsa və həmin cümlə üzvləri asanlıqla bərpa edilirsə, belə cümlələr *yarımçıq cümlələr* adlandırılır.

*Söz-cümlə* üzvlərə ayrılmayan, yəni üzvlənməyən sadə cümlə qrupuna daxildir.

Yarımçıq cümlədə buraxılan üzv mətnə əsasən bərpa edilə bildiyi halda, söz-cümlədə bu mümkün deyil. Çünki söz-cümlədə ilkin fikrə münasibət ifadə edildiyinə görə buna ehtiyac qalmır. Məsələn:

1. – *Bəs gəlinimizin işi, vəzifəsi?*
   – *Hələ oxuyur.*
   – *Harada?*
   – *Universitetdə.*
2. – *Yəni demək istəyirsən ki, toyunuzu ikilikdə etmisiniz?*
   – *Yox.*
   – *Aranı vurmuşam.*
   – *Qızın ata-anasıynan?*
   – *Xeyr.*

Birinci qrup cümlələrdə buraxılan üzvlər – "gəlinimiz", "oxuyur" (mübtəda və xəbər) zərurət olduğu halda bərpa oluna bilər. İkinci qrupda isə əvvəlki fikrə cavab söz-cümlə ilə verilərək tamamlayıcı xarakter daşıyır.

*"Ümumiyyətlə, əlaqəli nitqdə məzmunca yarımçıq cümlə ola bilməz. Bu yarımçıqlıq onun müstəqil işlədilə bilən bütöv variantına nisbətən ancaq formada müşahidə olunur"* [1, s. 30].

Qrammatikada – mübtəda, məntiqdə subyekt; qrammatikada xəbər, məntiqdə predikat; cümlə – hökm kateqoriyaları bir-birinə yaxın olduğu kimi, natamam induksiya ilə yarımçıq cümlə kateqoriyaları da əlamət və predmetcə bir-birinə uyğundur.

*"Natamam induksiyada müəyyən məntiqi sinfə daxil olan predmet və hadisələrin bir qismi haqqında fikir yürüdülür, sonra ümumiləşdirmə aparılır, alınan nəticə sinfin bütün ünsürlərinə aid edilir. Burada predmetlər arasındakı oxşarlıq, əlamət əsas götürülür"* [2, s. 16].

*"Deduksiyadan fərqli olaraq, induksiyada bəzi predmet və hadisələrdəki xassələrin təkrar olunmasına əsasən sinif haqqında ən ümumi nəticə çıxarmağa məntiqi zərurət duyulmur, çünki ola bilər ki, əlamətlərin təkrarlığı sadəcə təsadüfün nəticəsidir"* [3, s. 118].

Yarımçıq cümlələrdə buraxılmış üzvlər ümumi mətn situasiyasına əsasən müəyyənləşdirilir və yuxarıda qeyd etdiyimiz kimi, əgər məntiqi zərurət duyulursa, yerlərinə bərpa edilə bilir. Natamam induksiyada olduğu kimi, yarımçıq cümlələrdə də ayrı-ayrı strukturlu konstruksiyaların ifadə etdiyi fərdi semantik çalar mətn şəraiti cəhətdən ümumi məzmun xətti əsasında vəhdət təşkil edir.

Yarımçıq cümlələr üslubi cəhətdən daha aktivdir. Əgər nitqin obyekti olan bir

üzvün adı əvvəlki cümlədə çəkilmişsə, ikinci cümlədə onun təkrarına ehtiyac qalmadığı üçün buraxılmış olur.

*“Fikirlərimizi həmişə bütöv cümlələrlə ifadə etsək, dil çətinləşər, təkrarçılıq artar. Azərbaycan dilində sözçülüyə yer yoxdur. Burada maksimum qənaət prinsipinə əməl olunur. Morfemin və cümlənin potensial imkanından daha çox istifadə olunur”* [4, s. 53].

Buna görə də istər şifahi, istərsə də yazılı nitqimizdə nitqin yığcam, ifadənin ahəngdar, üslubun gözəl olması və təkrarçılığın qarşısının alınması üçün yarımçıq cümlələrdən istifadə edilir.

“Yarımçıq cümlələrin bu cür stilistik potensialı şifahi nitqin istər dialoji, istərsə də monoloji tipində aktiv təzahür edir. Belə struktur tipli cümlə üslubi sferada əsasən dialoji nitq mühitində müşahidə edilir” [6, s. 123]. Bu stilistik mövqedən çıxış edərək demək mümkündür ki, yarımçıq cümlə kontekstdən (mətndən) təcrid edilmiş məqamda heç bir fikir ifadə etmir. Yarımçıq cümlələrdə onun hər hissəsinin həqiqəti nə dərəcədə əks etdirdiyini yalnız kontekstin ümumi struktur semantikasından bilmək mümkündür.

Mübtəda və xəbəri buraxılmış cümlə yalnız üzvün çatışmazlığına və mövcud cümlənin quruluşuna görə yarımçıqdır, ümumi mətn semantikası həmin yarımçıqlığı asanlıqla tamamlayır. Odur ki yarımçıq cümlələri şərh edərkən ilk araşdırmada onlara mətndən, onun müxtəlif əlaqəsindən, struktur-semantik münasibəti baxımından və s. yanaşmaq məqsədəuyğundur.

**Nəticə**

Danışıq dilimiz müxtəlif xarakterli və quruluşlu cümlələrdən ibarətdir. Əgər nitqin obyekti olan bir üzvün adı əvvəlki cümlədə çəkilmişsə, ikinci cümlədə onun təkrarına ehtiyac olmadığı üçün həmin üzv buraxılır. Başqa sözlə, dilimizdə adları çəkilən və lazım gəldikdə müxtəlif amillər (kontekst, situasiya, dialoq) vasitəsilə bərpası asanlıqla mümkün olan üzvlərin reduksiyası mövcuddur. Bu cür cümlələr yarımçıq olur. Məsələn:

*Oruc bəy ayağa durdu, dostunu da qaldırmaq istədi. Bünyad bəy getmək istəmədi:*

– *Hara?*

– *Evə.*

*Əli ilə yuxarını göstərdi və dedi:*

– *Evim buradır* [5, s. 70].

Söz-cümlələrdə isə vəziyyət bir qədər fərqlidir. Belə ki, cavab söz-cümlə, özündən əvvəlki fikrin tələbinə uyğun olaraq, yalnız bir dəfə cavablandırılır. Burada “buraxılmış söz”dən söhbət gedə bilməz.

Belə qənaətə gəlmək mümkündür ki, yarımçıq cümlələr üslubi cəhətdən söz-cümlə ilə müqayisədə daha geniş linqvistik xüsusiyyətlərə malikdir. Bu isə onun kommunikativ funksiyasını təşkil edən komponentlərinin üzvlənən leksik vahidlərdən ibarət olması ilə əlaqədardır. Yəni kommunikativlik cəhətdən çoxfunksiyalı xarakterə malik olmasıdır.

**Ədəbiyyat**

1. Cəfərov, N. (2007). *Seçilmiş əsərləri* (5 cilddə). Elm.
2. Dəmirçizadə, Ə. (1950). *Müasir Azərbaycan dilində sadə cümlələr.* Azərbaycan Elmlər seriyası.
3. Kazımov, Q. (2010). *Müasir Azərbaycan dili sintaksis* (IV hissə). Elm və təhsil.
4. Sadıqova, B. (1957). Bütöv və yarımçıq cümlələr haqqında. *"Azərbaycan dili və ədəbiyyat tədrisi" elmi-metodik jurnal*, 12, 50–55.
5. Süleymanlı, Y. (2010). *Azərbaycan və ingilis dillərində sadə cümlə*. Elm və təhsil.
6. Veysəlli, F. (2008). *Struktur dilçiliyin əsasları.* Mütərcim.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 19–29
https://doi.org/10.48445/k2673-7816-7700-f

# Ədəbiyyat təlimində şagirdlərin müstəqilliyinin inkişaf etdirilməsi imkanları

***Soltan Hüseynoğlu*** [1]

**XÜLASƏ**
*Ölkəmizdə həyata keçirilən təhsil islahatı müstəqil düşüncəli, qarşılaşdığı problemlərin həll yollarını müəyyənləşdirməyi bacaran gənc nəslin tərbiyə edilməsini ciddi vəzifə kimi qarşıya qoymuşdur. Bu vəzifənin reallaşdırılması tədris vasitələrinin təkmilləşdirilməsindən əhəmiyyətli dərəcədə asılıdır. Təsadüfi deyildir ki, yeni təhsil proqramının – kurikulumun hazırlanmasına, tətbiqinə və təkmilləşdirilməsinə xüsusi diqqət yetirilir. Ədəbiyyat fənn kurikulumunda da məsələnin vacib olması ardıcıl olaraq xatırladılır, konkret tələblər və yollar göstərilir. Başqa sözlə, şagirdlərin fəallığının, müstəqilliyinin inkişaf etdirilməsi fənnin əhatə etdiyi bütün məsələlərdə öz ifadəsini tapır. Yəni tərcümeyi-hal, icmal, ədəbi-nəzəri materiallar, monoqrafik mövzuların və s. öyrənilməsində qazanılmış biliklərin bacarıqlara çevrilməsi, şagirdlərin idrak fəallığının, təfəkkür müstəqilliyinin inkişaf etdirilməsi birinci dərəcəli vəzifə hesab edilir. Məqalədə təhsil proqramının və ədəbiyyat dərsliklərinin təhlili məhz bu istiqamətdə aparılmışdır.*

**AÇAR SÖZLƏR**
*kurikulum, təhsil proqramı, məzmun xətti, məzmun standartı, fəallıq, müsəqillik*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 15.12.2024
Qəbul edilib: 21.02.2025

[1] Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
https://orcid.org/0000-0003-4182-6653 | soltanhuseynoglu@mail.ru

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 1 /19–29
https://doi.org/10.48445/k2673-7816-7700-f

# Possibilities of Developing Students' Independence in Literature Education

***Soltan Huseynoghlu*** [1]

**ABSTRACT**
*The education reform carried out in our country has set as a serious task the upbringing of the young generation who are independent-minded and able to determine the solutions to the problems they face. The realization of this task depends significantly on the improvement of teaching tools. It is no coincidence that special attention is paid to the development, implementation and improvement of the new educational program – curriculum. In the curriculum of the subject of literature, the importance of the issue is consistently mentioned, specific requirements and ways are indicated. In other words, the development of students' activity and independence finds its expression in all the issues covered by the subject. the transformation of acquired knowledge into skills, the development of students' mental activity and independence of thinking is considered a first-class task. It was in this direction that the analysis of the educational program and literature textbooks was carried out in the article.*

**KEYWORDS**
*curriculum, educational program, content line, content standard, activity, disability*

**ARTICLE HISTORY**
Received: 15.12.2024
Accepted: 21.02.2025

[1] Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan.
https://orcid.org/0000-0003-4182-6653 | soltanhuseynoglu@mail.ru

 

## Giriş

Ölkəmizdə dövlət müstəqilliyi bərpa olunandan sonra ictimai həyatın bütün sahələrində ciddi dəyişikliyin həyata keçirilməsi zərurətə çevrildi. Bu, təhsil sahəsindən də yan keçmədi. Rəsmi sənədlər əsasında, elmi müstəvidə təhsil islahatının gerçəkləşdirilməsi işi davamlı xarakter aldı. Təhsilin məzmunundakı dəyişiklik proqram və dərsliklərin yenilənməsindən xeyli dərəcədə asılı idi. Məhz bu, yeni təhsil proqramının (kurikulumun) hazırlanmasını labüd etdi. Ənənəvi təhsil proqramından fərqli olaraq, kurikulum sənədi çoxcəhətliliyi, zəngin məzmunu ilə seçilir. Bu sənədin bütün bölmələrində şagirdlərin müstəqilliyinin inkişaf etdirilməsi ciddi tələb kimi ön plana çəkilir. Bir az da dəqiq deyilsə, təhsilalanların idrak fəallığının, təfəkkür müstəqilliyinin səmərəli inkişafı bu mühüm sənədin prinsip səviyyəsində dəyərləndirdiyi məsələdir. Təhsil proqramında deyilir: "Orta məktəbi bitirən hər bir gənc bədii ədəbiyyatı, digər mənbələri oxumağı, təhlil etməyi, qiymətləndirməyi, öz biliklərini müstəqil şəkildə artırmağı bacarmalı, fasiləsiz təhsilə hazır olmalıdır. Məktəb ədəbiyyat kursunda yüksək ideya-bədii dəyərə malik əsərlərin öyrədilməsi əsasında şagirdlərdə mütaliə bacarığı formalaşır, onların ədəbi təhsili, tərbiyəsi və inkişafı təmin olunur" [1, s. 6].

## Əsas hissə

Orta məktəb ədəbiyyat kursunun qarşısında qoyulan bu vəzifənin həyata keçirilməsi sənədin bütün bölmələrində, eləcə də fərqli istiqamətlərdə müəyyənləşdirilmiş təlim nəticələrində diqqət mərkəzində saxlanılmışdır. Başqa sözlə, şagirdlərin fəallığının, müstəqilliyinin inkişaf etdirilməsi fənnə aid bütün məsələləri əhatə edir. Yəni tərcümeyi-hal, icmal, ədəbi-nəzəri materialların, monoqrafik mövzuların və s. öyrənilməsində qazanılmış biliklərin bacarıqlara çevrilməsi, şagirdlərin əqli fəallığının, təfəkkür müstəqilliyinin inkişaf etdirilməsi birinci dərəcəli vəzifə hesab edilir. Ədəbiyyat fənn kurikulumunda əsaslandırılmış məzmun xətlərinin hər biri şagirdlərin inkişafına öz töhfəsini verir. Məzmun xətlərindən birincisi – ədəbiyyat və həyat həqiqətləri bilavasitə bədii nümunələrin öyrənilməsi ilə bağlıdır. Ümumi orta təhsil səviyyəsi üzrə bu məzmun xəttinin başlıca məqsədini belə ifadə etmək olar: ədəbi əsərlərin müstəqil qavranılmasına, təhlilinə və qiymətləndirilməsinə nail olmaq... Sənəddə deyilir: "Ədəbiyyat və həyat həqiqətləri məzmun xətti bədii ədəbiyyatda əksini tapan milli-bəşəri dəyərlərin, mənəvi-estetik problemlərin qavranılması, təhlili, onlara əsaslandırılmış münasibətin formalaşdırılması, mürəkkəb həyat hadisələrinin, ziddiyyətli situasiyaların dərk edilməsinə və qiymətləndirilməsinə zəmin yaradır" [1, s. 10].

Ümumi orta təhsil səviyyəsi üzrə ikinci məzmun xəttinin əsasında da şagirdlərin inkişafı, fəallıq və müstəqilliyinin inkişafı dayanır. Həmin məzmun xəttinin məqsədi ilə bağlı sənəddə oxuyuruq: “Şifahi nitq məzmun xətti ədəbi nümunələrlə bağlı fikirlərin obrazlı sözlərdən, bədii təsvir və vasitələrdən istifadə etməklə aydın, ardıcıl, məqsədyönlü və yığcam ifadə edilməsinə imkan yaradır” [1, s. 10].

Məzmun standartlarının siniflər üzrə və siniflərarası izləməklə şagirdlərin idrak fəallığının, müstəqil düşüncələrinin dinamikasını müşahidə etmək mümkündür. Məsələn, ayrı-ayrı məzmun standartlarının siniflər üzrə necə dərinləşdiyini nəzərdən keçirək:

| **Məzmun standartları** | | | | |
|---|---|---|---|---|
| **V sinif** | **VI sinif** | **VII sinif** | **VIII sinif** | **IX sinif** |
| 1.2.1. Şifahi və yazılı ədəbiyyat nümunələrini müqayisə edir. | 1.2.1. Bədii nümunələri (əfsanə, nağıl, dastan, təmsil, hekayə) janr xüsusiyyətləri baxımından müqayisə edir. | 1.2.1. Bədii nümunələri (dastan, hekayə, mənzum hekayə) növ və janr baxımından müqayisə edir. | 1.2.1. Bədii nümunələri (dastan, hekayə, novella, dram, poema) növ və janr baxımından müqayisə edir. | 1.2.1. Bədii nümunələri (hekayə, povest, roman, dram, poema) növ və janr baxımından müqayisə edir. |
| 1.2.2. Obrazların xarakterindəki başlıca xüsusiyyətləri aydınlaşdırır, əsaslandırılmış münasibət bildirir. | 1.2.2. Bədii nümunələrdəki qəhrəmanları davranış və əməllərinə görə səciyyələndirir. | 1.2.2. Digər obrazlarla müqayisə etməklə və yazıçının münasibətinə əsaslanmaqla ədəbi qəhrəmanları səciyyələndirir. | 1.2.2. Obrazların nitqinə, bağlı olduqları məişət təsvirlərinə əsaslanmaqla səciyyələndirir. | 1.2.2. Digər obrazların və müəllifin mühakimələrinə əsaslanmaqla ədəbi qəhrəmanları səciyyələndirir. |

Birinci məzmun standartının (1.2.1.) tələbinin siniflər üzrə dərinləşdirilməsi, göründüyü kimi, *yeni* janrların artırılması əsasında həyata keçirilmişdir. İkinci məzmun standartının (1.2.2.) tələbinin dərinləşdirilməsi obrazların təhlilinin müxtəlif siniflərdə

fərqli təşkili ilə bağlıdır. Məsələn, V sinifdə obrazların xarakterindəki başlıca xüsusiyyətlərin aydınlaşdırılması və bunlara münasibət bildirilməsi həmin standartın başlıca tələbidir. VI sinifdə bu standartın tələbi dərinləşdirilmişdir: *Bədii nümunələrdəki qəhrəmanları davranış və əməllərinə görə səciyyələndirir.* Deməli, V sinifdə mənimsənilənlər də nəzərə alınmaqla bu sinifdə obrazların təhlili dərinləşdirilir. VII sinifdə həmin standartın tələbi daha da dərinləşdirilmişdir: *Digər obrazlarla müqayisə etməklə və yazıçının münasibətinə əsaslanmaqla ədəbi qəhrəmanları səciyyələndirir.* Standartda iki istiqamətdə fəaliyyətin reallaşdırılması nəzərdə tutulmuşdur:

– obrazların müqayisəli təhlili,
– yazıçının münasibətinə əsaslanmaqla obrazların səciyyələndirilməsi.

Standartda müqayisə tələbinin olması müsbət haldır. Müqayisə faydalı əqli əməliyyat olub, obyektin dərindən və əhatəli öyrənilməsinə, müstəqil düşüncənin inkişafına əhəmiyyətli dərəcədə təsir edir. Ədəbi qəhrəmanlar bir-birindən təcrid olunmuş şəkildə təhlil olunarkən sezilməyən cəhətlər müqayisəli təhlil prosesində əhatəli şəkildə aşkara çıxarılır. Onu da qeyd etmək lazımdır ki, müqayisənin VII sinifdə xatırlanması o demək deyil ki, aşağı siniflərdə ondan istifadə olunmur. Həmin priyom ibtidai təhsil pilləsindən başlayaraq ardıcıl tətbiq edilir. VII sinifdə standart səviyyəsində tətbiqi şagirdlərdə müqayisə bacarığının formalaşdırılması və bunun qiymətləndirilməsi tələbinin rəsmiləşdirilməsi deməkdir.

VIII sinifdə isə həmin standart (1.2.2.) ədəbi qəhrəmanların təhlilinə fərqli mövqedən yanaşmağı tələb edir: *Obrazların nitqinə, bağlı olduqları məişət təsvirlərinə əsaslanmaqla səciyyələndirir.* Göründüyü kimi, standart iki istiqamətdə fəaliyyəti özündə əks etdirir:

– obrazların nitqinə əsaslanmaqla təhlil olunması,
– məişət təsvirlərinə əsaslanmaqla ədəbi qəhrəmanların təhlil edilməsi.

Obrazların nitq xarakteristikasından çıxış etməklə onların səciyyələndirilməsi metodik ədəbiyyatda faydalı iş növlərindən biri kimi dəyərləndirilir. Bu standartın tələbi səkkizinci sinif şagirdləri üçün əlverişlidir. Həmin standartın təhlil prosesində səmərəli olması əvvəlki mərhələlərdə hazırlıq işlərinin aparılmasını tələb edir. Daha dəqiq deyilsə, oxuda, məzmun üzrə işin aparılmasında ədəbi qəhrəmanların nitqi üçün səciyyəvi olanlara diqqət yetirilməsi, nümunələrin seçilməsi metodik ədəbiyyatda xüsusi qeyd edilib. Şagirdlər təhlil dərslərində həmin nümunələrdən fikirlərini əsaslandırmaq üçün istifadə edirlər.

Ədəbiyyatşünaslığımızda obrazlarla bağlı məişət təsvirlərinə müraciət olunması təhlil priyomlarından sayılır. Məişət təsvirlərinin ətraflı öyrənilməsi obrazın həyat tərzi, maraqları, adət və vərdişləri və s. barədə təsəvvürün qazanılmasına imkan yaradır.

IX sinifdə bu standart (1.2.2.) ədəbi qəhrəmanların təhlilinə geniş müstəvidə yanaşmağı tələb edir: *Digər obrazların və müəllifin mühakimələrinə əsaslanmaqla ədəbi qəhrəmanları səciyyələndirir.* Standart iki istiqamətdə fəaliyyətin gerçəkləşdirilməsini nəzərdə tutur:

– digər obrazların mühakimələrindən çıxış etməklə ədəbi qəhrəmanın səciyyələndirilməsi,
– müəllifin mühakimələrinə əsaslanmaqla obrazın səciyyələndirilməsi.

Standart, təbiidir ki, əsərin oxusu və məzmununun öyrənilməsi prosesində öyrənilmiş məlumatlardan geniş faydalanmağı tələb edir. Bu standartın tələblərinin reallaşdırılması asan deyil. Məsələ bundadır ki, müəyyən ədəbi qəhrəman haqqında digərləri obyektiv, ədalətli olmayan mühakimələr yürüdə bilər, yaxud fərqli, ziddiyyətli fikirlər səsləndirilə bilərlər. Bütün bunlar oxucudan-şagirddən diqqətli olmağı, deyilənləri saf-çürük etməyi, həqiqi olanları müəyyənləşdirməyi və təhlildə onlardan yararlanmağı tələb edir.

Standartın ikinci tələbini də reallaşdırmaq asan deyil. Bədii mətndə müəllifin obrazlar, fakt və hadisələr haqqındakı mühakimələri heç də həmişə qabarıq ifadə olunmur. Müəllif çox vaxt fikirlərini üstüörtülü, yaxud mətnaltı mənalarla əks etdirir. Bu, oxucudan diqqətli olmağı, sözə həssas yanaşmağı tələb edir. Müəllif mühakimələrinin aşkara çıxarılması işin yarısıdır, onun ədəbi qəhrəmana münasibətini müəyyənləşdirmək və dəyərləndirmək təhlilin səmərəli olmasında mühüm rol oynayır.

Şagirdlərin müstəqilliyinin inkişaf etdirilməsi məsələsinə "Ədəbiyyat" dərsliklərində münasibət necədir?

Məktəblilərdə müstəqilliyin inkişafı üzrə tapşırıqların ədəbiyyat dərsliklərində ardıcıl verilməsinə 1990-cı illərdən diqqət yetirilməyə başlanmışdır. Bu, əlbəttə, ilk növbədə yeni proqramların tələbi ilə bağlı olmuşdur. Ölkəmizdə dövlət müstəqilliyi bərpa olunandan sonra təhsil sahəsində ardıcıl olaraq həyata keçirilən islahatlar yeni məzmunlu dərsliklərin hazırlanmasına da səbəb olmuşdur. Az sonra pilot məktəbləri üçün çap edilən ədəbiyyat dərsliklərindəki tapşırıqlar isə müstəqil işlərin dərsdə daha geniş yer tutmasına imkan yaratmışdır. Məhz pilot məktəblərinin dərslikləri yeni təhsil proqramının (kurikulumun) tələbləri əsasında dərsliklərin hazırlanmasında baza rolunu oynamışdır. Məlumdur ki, müəllim və şagirdlər əməli olaraq dərslik üzərində işləyirlər. Dərsliyin məzmunu və metodik quruluşu ondan istifadə edənlərin fəaliyyətinə istiqamət verir. Dərsliklərin məzmununun müvafiqliyi, metodik quruluşunun mükəmməl olması şagirdlərin idrak fəaliyyətinin düzgün istiqamətləndirilməsinə, onların təfəkkürünün inkişafına əsaslı təsir göstərir. Məktəblilərin idrak müstəqilliyinin inkişafı dərsliklərin metodik quruluşu ilə sıx bağlıdır. Bütün bu cəhətlər yeni təhsil proqramının

(kurikulumun) əsasında hazırlanan ədəbiyyat dərsliklərində diqqət mərkəzində saxlanılmışdır. Bu proqram üzrə ilk "Ədəbiyyat" dərsliyi 2012-ci ildə V sinif üçün çap edilmişdir. İstər dərsliyin ilk nəşrində, istərsə də sonrakı illərdə təkmilləşdirilmiş nəşrlərində bədii əsərin öyrənilməsinin bütün mərhələlərində şagirdlərin müstəqil işinin həyata keçirilməsi üçün ardıcıl tapşırıqlar verilmişdir. Sinifdən-sinfə keçdikcə dərsliklərdəki tapşırıqlar zənginləşdirilmiş və proqramın tələbinə uyğun olaraq dərinləşdirilmişdir. Bütün bunların necə reallaşdırıldığını nümunələr əsasında nəzərdən keçirək.

İlk növbədə beşinci sinfin ədəbiyyat dərsliyindəki vəziyyətə diqqət edək. Dərslikdəki sualların, tapşırıqların, tövsiyə xarakterli metodik istiqamətlərin əsasında şagirdlərdə idrak fəallığının və müstəqilliyinin inkişaf etdirilməsi dayanır. Bu tələblər qarşılıqlı əlaqədə olub, sistem təşkil edir. Bütün bədii mətnlərin məzmununun öyrənilməsinə həsr edilmiş birinci dərs saatı "Yada salın" başlıqlı sualla başlayır. Həmin sual müxtəlif növ inteqrasiyanın reallaşdırılmasına geniş imkan yaradır. Məsələn, "Yetim İbrahimin nağılı" tədris edilərkən şagirdlərə ilk verilən sual belə olur: *Oxuduğunuz, dinlədiyiniz nağıllarda diqqətinizi daha çox çəkən nə olub?*

Sual şagirdləri düşünməyə, aşağı siniflərdə öyrəndikləri nağılları xatırlamağa, hiss və düşüncələrini vaxtilə məşğul etmiş məsələlərin üzərinə bir daha qayıtmağa yönləndirir. Təfəkkürünü fəal işə qoşan şagird təbiidir ki, nağılların təkcə məzmununu yox, onların təhlilindən mənimsədiklərini də yada salmalı və xatırlatmalı olur.

"Yada salın" başlıqlı suallar bir çox hallarda daha konkret olub müstəqil düşüncənin konkret fəaliyyətini tələb edir. Məsələn, "Üç qardaş" nağılı ilə bağlı "Yada salın" blokunun sualında olduğu kimi: *Nağıllarda şər qüvvələri kimlər təmsil edir?*

Dərslikdəki ikinci blok "Düşünün" adlanır və onun suallarına cavab əsərin tədrisi boyu axtarılır. Bu qəbildən suallar əvvəlcədən qazanılmış bilikləri yada salmağa, eləcə də yeni dərsdə öyrənilənləri səfərbər etməyə istiqamətləndirir. Bir çox hallarda isə onlar problem xarakterli olur: *Nağıl qəhrəmanlarının çətin sınaqlardan üzüağ çıxmasına səbəb nə ola bilər? Doğma yurda həsr olunmuş əsərlər üçün oxşar olan cəhətlər nə ola bilər?*

Göründüyü kimi, "Yada salın", "Düşünün" bloklarında suallar şagirdlərin müstəqil düşüncəsinin, məntiqi və yaradıcı təfəkkürünün inkişafına əhəmiyyətli dərəcədə təsir edir.

Dərslikdəki növbəti blokun ("Oxuda aydınlaşdırın") tapşırıqları birbaşa məzmun standartlarının reallaşdırılmasına xidmət edir. Belə ki, birinci tapşırıq – "Əsərdə tanış olmayan sözlərin mənasını lüğətlərin, sorğu kitablarının köməyi ilə aydınlaşdırın" ayrıca standartın (1.1.1. Heca vəznli şeirlərdə və sadə süjetli bədii nümunələrdə (əfsanə,

nağıl, təmsil, hekayə) tanış olmayan sözlərin mənasını lüğətlərdən istifadə etməklə aydınlaşdırır) reallaşdırılması məqsədi ilə dərsliyə daxil edilmişdir.

İkinci tapşırıq – "Əsərdəki bədii təsvir və ifadə vasitələrini müəyyənləşdirin" başqa bir standartın (1.1.5. Heca vəznli şeirlərdə, sadə süjetli bədii nümunələrdə bədii təsvir vasitələrini (epitet, təşbeh) müəyyənləşdirir) reallaşdırılması məqsədini güdür.

Müəyyənedici eksperiment zamanı məlum olmuşdur ki, hər iki standart şagirdlərin müstəqil işləmələrinə əlverişli imkan yaradır. Şagirdlər yalnız lüğətlərdən deyil, sorğu kitablarından da istifadə etməklə özlərinə tanış olmayan sözlərin mənasını aydınlaşdırırlar.

Həmin standartla (1.1.5.) ikinci əsas standartın alt standartı (1.2.3. Şifahi və yazılı ədəbiyyat nümunələrində bədii təsvir vasitələrinin (epitet, təşbeh) rolunu aydınlaşdırır) arasındakı əlaqə məktəb təcrübəsində nəzərə alınır. İkinci standartla bağlı dərslikdə təklif edilmiş müxtəlif növ tapşırıqlar şagirdlərin müstəqil fəaliyyətinə səmərəli istiqamət verir.

Dərslikdəki növbəti tapşırıq "Məzmun üzrə iş" başlığı altında təklif edilmişdir. Bu tapşırığın tələbləri şagirdlərin müstəqil işinin daha əhatəli təşkilinə imkan verir. Tapşırıqlardan birinin timsalında həmin tələblərə nəzərə salaq. Ə. Cavadın "Azərbaycan! Azərbaycan!" şeirinin birinci dərsində məzmun üzrə işin aşağıdakı ardıcıllıqla təşkili məsləhət görülmüşdür:

"1. Əsəri oxuyun (bunu fərdi səssiz oxu, səsli oxunun dinlənilməsi və s. şəkildə yerinə yetirə bilrsiniz).

2. Dörd qrupa bölünün, hər qrup iki bənd üzərində işləməklə, fikirlərinizi ikihissəli gündəlikdə yazın. Bunun üçün aşağıdakı cədvəldən istifadə edin.

| Əsərdə diqqətimizi daha çox cəlb edənlər | Bunun səbəbi |
|---|---|
| | |

3. Gəldiyiniz nəticələri təqdimatlar əsasında müzakirə edin.
4. Mövzulardan birini seçib təqdimata hazırlaşın.

a) "Şeirdə vətənimiz haqqında yeni nə öyrəndim?" Öyrəndiyiniz yeni sözlərdən istifadə edin.

b) "Şeirdə ən çox xoşladığım bəndlər hansılardır?" seçiminizi əsaslandırın" [2, s. 46].

Tapşırıq bütövlükdə şagirdlərin müstəqil fəaliyyətinin reallaşdırılması üçün nəzərdə tutulmuşdur. Əsərin hansı formada oxunmasından asılı olmayaraq, şagirdlər həmin prosesdə fikir mübadiləsi aparırlar. Başqa sözlə, onlar öz mövqelərini bildirmək, əsər-

dəki təsvir və hadisələr barədə müstəqil fikir söyləmək imkanı qazanırlar. İkihissəli gündəliyin hazırlanması isə müstəqil iş üçün maraqlı və faydalı tapşırıqdır. Təqdimatların hazırlanması fənnüstü inteqrasiyanın reallaşdırılması, mətnə tənqidi münasibətin yaradılması baxımından faydalıdır.

Dərslikdə "Təhlil üzrə iş" başlığı altında verilmiş tövsiyələrin, tapşırıqların araşdırılmasından aydın olur ki, şagirdlərin müstəqilliyinin inkişaf etdirilməsi bədii əsərlərin təhlilinə həsr olunmuş dərslərdə də diqqət mərkəzində saxlanılır. Dərslikdəki "Əsərlə bağlı açıqlamalar" başlıqlı tövsiyədə üç məqsəd izlənilir:

– əsərin başa düşülməsinə istiqamət verir,
– təhlildə nələrə daha çox diqqət yetirməyin vacib olduğunu ön plana çəkir,
– nəzəri anlayışlar şərh edilir.

Maraqlıdır ki, bu tövsiyədə əhatəli hazır bilik verməkdən imtina edilmişdir. Həmin mətndə daha çox istiqamətləndirilmiş suallardan istifadə edilməsinin başlıca səbəbi də budur. Bütün bunların sayəsində həmin tövsiyə şagirdlərin müstəqil fəaliyyətinə əlverişli şərait yaradır.

Dərslikdə "Araşdırın. Fikirləşin. Cavab verin" başlığı altında verilmiş növbəti tapşırıq bütövlükdə şagirdlərin müstəqil fəaliyyəti əsasında yerinə yetirilmək üçün nəzərdə tutulmuşdur. Tapşırıqda məzmun standartlarının reallaşdırılmasına xidmət edən tələblər əks etdirilmişdir. Tapşırıqda diqqəti cəlb edən ən mühüm cəhətlərdən biri söylənmiş fikirlərin bədii mətndən gətirilən nümunələrlə əsaslandırılmasıdır. Ə.Cəmilin "Can nənə, bir nağıl de!" şeirinin təhlilinə aid tapşırığın timsalında nümunəyə nəzər salaq:

"1. Nənənin xasiyyətindəki hansı cəhətlər diqqətinizi cəlb etdi? Fikrinizi əsaslandırın.

2. Nənə ilə söhbətində nəvənin xasiyyətindəki hansı cəhətlər üzə çıxır?
3. Nəvə yalnız nağıl həvəskarıdırmı? Fikrinizi nümunələrlə əsaslandırın.
4. Şeirdə işlənmiş bədii təsvir vasitələrinin fikrin təsir gücünün artmasında rolunu aydınlaşdırın. Cədvəldən istifadə edin.

| Şeirdə işlənmiş bədii təsvir vasitələri | Fikrin təsir gücünün artmasında onların rolu |
|---|---|
| | |

5. Şeir hansı mövzuda yazılıb?
6. Əsərdəki başlıca fikir – ideya, sizcə, nədir?" [2, s. 105].

Tapşırıqdakı sualların hər biri bədii mətnə dönə-dönə müraciət etməklə obrazların xarakterindəki başlıca cəhətləri müstəqil aydınlaşdırmağı ön plana çəkir. Müəyyənedici

eksperiment zamanı aydınlaşmışdır ki, təsvir vasitələrinin bədiiliyin artmasına hansı şəkildə təsir etdiyini müəyyənləşdirmək şagirdlər üçün çətinlik törətmir. Deməli, onların bu istiqamətdəki fəaliyyətində də müstəqilliyi müşahidə etmək olur.

Bəs VIII – IX siniflərin dərsliklərində vəziyyət necədir?

Bu dərsliklər V və VII siniflərin dərsliklərindən metodik istiqamətinə görə müəyyən qədər fərqlənir. Bunun başlıca səbəbi, təbiidir ki, proqramın tələbləri ilə bağlıdır. Məsələn, məzmun üzrə iş prosesində bilik və bacarıqların tətbiqi məqsədilə tapşırıqlardan geniş istifadə edilməklə yanaşı bu istiqamətdə sistemli iş aparmağa imkan verən "Tətbiq. Müzakirə. Yaradıcı iş" başlıqlı tapşırıqlardan da istifadə edilmişdir. Bu siniflərin dərsliklərində həmçinin müstəqil təhlilə istiqamət verən "Əsərin təhlilinə hazırlaşın" başlıqlı metodik tövsiyəyə geniş yer verilmişdir. Deyilənlərin məzmununu təsəvvür etməyə imkan verən nümunəyə (Ə. Haqverdiyevin "Bomba" əsərinin timsalında) nəzər salaq. Əsərin məzmununun öyrənilməsinə həsr edilmiş ikinci dərs saatında bilik və bacarıqların tətbiqini tələb edən tapşırıq təklif edilmişdir. Tapşırığın bütün bəndləri şagirdlərdən müstəqil düşüncə, əqli fəallıq tələb edir. Bunu tapşırığın elə birinci bəndindən görmək mümkündür: *Əsərin məzmununa aid üç sual yazın. Suallarınızı parta yoldaşınızla dəyişib onlara cavab hazırlayın və müzakirə edin.* Göründüyü kimi, tapşırıq bir neçə istiqamətdə işin aparılmasını tələb edir: məzmuna aid üç sualın tərtib edilməsi, başqasının hazırladığı suallara cavabların hazırlanması, nəticələrin müzakirə edilməsi.

Tapşırığın ikinci tələbi də şagirdlərdən bilik və bacarıqlarını tətbiq etməyi, müstəqil yanaşma tələb edir: *Əsəri hissələrə ayırıb, birinə ad verin. Məzmununu hazırladığınız plan əsasında yaradıcı nağıl edin.*

Təhlil üzrə təklif edilmiş tapşırıqlar "Araşdırın. Fikirləşin. Cavab verin" başlığı altında verilmişdir. Tapşırıqların tələbləri xeyli dərəcədə mürəkkəbdir. Bu, ilk növbədə standartların məzmunundan irəli gəlir. Tapşırıqlardan nümunələrə baxaq:

1. Əsər sizdə hansı təəssürat yaratdı? Fikrinizi təsdiq edən misallar göstərin.
2. Kərbəlayı Zal obrazını səciyyələndirin. Onun nitqinə əsaslanmağı unutmayın.
3. Yazıçını bu əsərdə düşündürən başlıca problemi müəyyənləşdirin. Onu mühüm hesab etmək olarmı?
4. "Əsər bitkin süjeti, mükəmməl kompozisiyası ilə seçilir" fikrinə nümunələrə əsaslanmaqla münasibət bildirin [4, s. 120].

Göründüyü kimi, sual və tapşırıqların hamısı düşünməyi, axtarışlar aparmağı, müstəqil münasibət bildirməyi diqqət mərkəzinə çəkir. Birinci sual ümumi səciyyəli olub əsərə əhatəli münasibət bildirməyi tələb edir. Sualın ikinci tərəfi (misalların göstərilməsi tələbi) cavabın konkret olmasını şərtləndirir.

İkinci sual obrazların təhlili ilə bağlı əvvəlki siniflərdə mənimsənilmiş bacarıqların tətbiqini zəruri edir. Başqa sözlə, obrazın xarakterindəki, davranış və əməllərindəki başlıca cəhətləri, digər obrazların onun haqqında dediklərini və s. xatırlatmağı ön plana çəkir.

Tapşırıqdakı digər suallara cavabların hazırlanması da şagirdlərin müstəqil düşüncələrinin, fikri axtarışlarının fəal işindən asılıdır.

**Nəticə**

Deyilənlərdən aydınlaşır ki, V – IX siniflərin ədəbiyyat dərsliklərindəki sual və tapşırıqlar, metodik tövsiyələr şagirdlərdə müstəqilliyin inkişafına imkan yaradan faydalı vasitə kimi dəyərləndirilməlidir.

**Ədəbiyyat**

1. *Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün ədəbiyyat fənni üzrə Təhsil Proqramı* (Kurikulumu). V – XI siniflər. (2013).
2. Ədəbiyyat. (2019). *8-ci sinif üçün dərslik*. Bakınəşr.
3. Ədəbiyyat. (2020). *9-cu sinif üçün dərslik*. Bakınəşr.
4. Ədəbiyyat. (2022). *5-ci sinif üçün dərslik*. Bakınəşr.
5. Ədəbiyyat. (2022). *7-ci sinif üçün dərslik*. Bakınəşr.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 30–40
https://doi.org/10.48445/e3301-5428-5329-a

# Müasir Azərbaycan dilində frazeologiyanın sərhədləri

***Elşad Abışov*** [1]

**XÜLASƏ**
*Məqalədə müasir Azərbaycan dilçiliyində aktuallığı ilə diqqəti cəlb edən frazeologiya və onun sərhədlərinin dəqiq müəyyənləşdirilməsi istiqamətində araşdırmalar aparılır; bir çox hallarda məcazi mənalı mürəkkəb feillərlə eyniləşdirilən feili frazeoloji vahidlərin hüdudları müqayisə yolu ilə spesifik xüsusiyyətlər əsasında dəqiqləşdirilir. Tədqiqatda həmçinin məzmununda frazeoloji vahidlərin bir sıra xüsusiyyətlərini əks etdirən və bu səbəbdən "frazeoloji vahidlər" adı altında öyrənilən atalar sözləri və məsəllərin, həmçinin bu kateqoriyadan olan digər vahidlərin struktur-semantik xüsusiyyətlərinə görə frazeoloji birləşmələrdən fərqli söz qrupları olduğu aydınlaşdırılır, irəli sürülən mülahizələr mövcud qanunauyğunluqlar və praktik materiallar əsasında zənginləşdirilir.*

**AÇAR SÖZLƏR**
*frazeologiya, idiom, semantika, feil, qrammatika, leksika*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 12.11.2024
Qəbul edilib: 25.02.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
https://orcid.org/0000-0002-2707-729X | elsad_abisov@mail.ru

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 1 / 30–40
https://doi.org/10.48445/e3301-5428-5329-a

# The Boundaries of Phraseology in the Modern Azerbaijani Language

***Elshad Abishov*** [1]

**ABSTRACT**
*In modern Azerbaijani linguistics, phraseology, which attracts attention with its relevance, and its boundaries are being researched. In researches, in many cases, the limits of verb phraseological units identified with complex verbs with figurative meaning are clarified based on specific characteristics through comparison. In the research, it is also clear that the proverbs and proverbs (all units of this category), which reflect a number of features of «phraseological units» in their content and therefore are studied under the name of phraseological units, have different groups of words in phraseological combinations due to their structural-semantic characteristics. The proposed considerations are enriched with existing laws and practical materials.*

**KEYWORDS**
*phraseology, idiom, semantics, verb, grammar, lexicon*

**ARTICLE HISTORY**
Received: 12.11.2024
Accepted: 25.02.2025

---

[1] Doctor of Philosophy in Philology, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0000-0002-2707-729X | elsad_abisov@mail.ru

 

**Giriş**

Dilçilikdə strukturuna və semantik spesifikliyinə görə maraq doğuran sahələrdən biri *frazeologiya* adlanır. Frazeoloji vahidlərin sistemli tədqiqinə, əsasən, XX əsrin ikinci yarısından başlanmış, ötən dövr ərzində bu elm sahəsinin nəzəri əsaslarını müəyyən edən tutarlı mülahizələr irəli sürülmüşdür. Aparılan araşdırmalara əsasən, frazeologiyanın dilçilikdə müstəqil bir bölmə olduğu müəyyən edilmişdir.

**Əsas hissə**

Müşahidələr göstərir ki, bu sahədə bir sıra köklü problemlər həllini tapsa da, frazeoloji vahidlərin təsnifi məsələlərini əhatə edən müəyyən çatışmazlıqlar hələ də qalmaqdadır. Belə ki, bəzi tədqiqat əsərlərində frazeoloji vahidlər sırasına atalar sözləri, zərbi-məsəllər, aforizmlər, hikmətli sözlər, tapmacalar, sabit söz birləşmələri, qanadlı sözlər, leksik mənaya malik tək-tək sözlər daxil edildiyi halda [2, s. 10 – 77]; [7, s. 99 – 104]; [8, s. 168 – 175]; [10, s. 270 – 276]; [13, s. 366 – 370], bəzilərinə, sadəcə, sabit birləşmələr aid edilir [3, s. 27].

Professor Əbdüləzəl Dəmirçizadə frazeoloji vahidləri (idiom adı altında) üç qrupa bölür:

1. **İdiomatik sözlər.** Məsələn: *tülkü* – hiyləgər; *dəm* – bir az kefli; *dayı* – məsul vəzifədə olan arxa və s.
2. **İdiomatik ifadələr** (sabit söz birləşmələri – E. A.). Məsələn: *baş ağartmaq*; *göz-qulaq olmaq*; *əl-ayağa düşmək* və s.
3. **İdiomatik cümlələr.** Məsələn: *sən öl*; *ağır otur, batman gəl* və s. [8, s. 168].

Professor M. Mirzəliyeva frazeoloji vahidlərin struktur bölgüsünə münasibətdə Ə. Dəmirçizadə ilə demək olar ki, eyni mövqedən çıxış edir. Hətta o, frazeologizmləri söz (o yaman *düşüb*), söz birləşməsi (*barmaqarası baxmaq*), cümlə (*işləməyən dişləməz*) şəklində təsnif etdikdən sonra, söz frazeoloji vahidləri quruluşca *sadə* (o bu gün nədənsə *dolmuşdu*), *düzəltmə* (o bu sözdən *alındı*) və *mürəkkəb* (o *vur-tut* bircə kitab almışdı) olmaqla üç növə ayırır [14, s. 74 – 76].

Hər hansı birləşmənin tərkibində işlənməyən müstəqil mənalı sözün müəyyən üslubi məqamda məcazilik qazanmasını əsas götürməklə frazeologiyaya aid edilməsi leksik məcazlarla frazeoloji vahidlərin sərhədinin qarışdırılmasına yol açır, çünki söz məcazilik qazanar-qazanmaz birbaşa frazeologiyanın obyektinə çevrilmir. Yazılı və şifahi nitq prosesində sözün semantik tutumunda meydana gələn məcazilik və ya obrazlılıq frazeoloji vahiddən əvvəl, sözdə çoxmənalılığın və bu əsasda leksik məcazların (metafora, metonimiya, sinekdoxa) yaranmasına gətirib çıxarır. Bu, Əbdü-

ləzəl Dəmirçizadə və M. Mirzəliyevanın söz-frazeologizmlərə aid verdikləri nümunələrdə də aydın görünür. Misallardakı *düşüb* (o bu gün yaman *düşüb*), *alınıb* (o bu sözdən *alındı*), *tülkü*, *dayı* sözlərinin hər biri mənanın köçürülməsi ilə formalaşdığından, əslində, metaforadır.

Söz və frazeoloji vahidlərin bir-birinə münasibəti fəlsəfi dilçilikdə təqribən belə ifadə olunur: "...frazeoloji vahidlər ikinci dərəcəli nominasiyanın bir növüdür (yəni ad yox, münasibət bildirir). Bu proses həm sadə sözləri, həm də sintaqmları (söz birləşmələrini – E. A.) əhatə edir. Sadə işarələrin ikinci dərəcəli nominasiyada iştirakı leksik metaforaların təşəkkülü ilə nəticələnir, sintaqmların iştirakı frazeoloji vahidlərin yaranmasına gətirir" [15, s. 48].

Doğrudur, bəzən dilçilikdə məcaz ədəbiyyat nəzəriyyəsi elminin tədqiqat obyekti sayılır. XX əsrin 50-ci illərindən sonra üslubiyyatın ədəbiyyat və dilçilik üslubiyyatına parçalanması nəticəsində məcaz hər iki elmin tədqiqat obyekti hesab olunur. Ədəbiyyat üslubiyyatı məcazı yalnız estetik bir kateqoriya kimi, incəsənət materialı kimi, dilçilik üslubiyyatı isə ilk növbədə leksik-semantik bir kateqoriya kimi araşdırır [9, s. 80 – 85].

Frazeoloji vahidlər isə semantik genişlənmədən sonra sözün məna sistemində (müdaxiləmiz olmadan) yeni yaranan məcazi mənalı vahidlərdən birinin başqa bir sözlə əlaqəyə girərək söz birləşməsi modelində qurulması ilə formalaşır. Ümumiyyətlə, frazeologiya dildə "sabit birləşmələr"i öyrənmək məqsədilə yaranmış bir elm sahəsidir. Bu anlayışı elmə ilk dəfə daxil edən İsveçrə dilçisi Şarl Balli (fransız dilinin tədqiqi ilə məşğul olmuşdur) yazır ki, dilə möhkəm şəkildə daxil olmuş birləşmələr *frazeologiya* adlanır [15, s. 546]. Frazeologiyanın müstəqil bir elm sahəsi olaraq formalaşmasında müstəsna xidmətləri olan V. V. Vinoqradov da nitqə hazır şəkildə daxil olan bütün birləşmələri *frazeoloji birləşmələr* adlandırır [17, s. 89].

Bütün bunlar birmənalı olaraq deməyə əsas verir ki, frazeologiyanın əhatə dairəsi sözlərlə deyil, birləşmələrlə hüdudlanır.

Birləşmələrdən söz açarkən unudulmamalıdır ki, dilin inkişafı prosesində məcazi mənalı mürəkkəb sözlərin müəyyən bir qrupu tarixən qovuşma idiomlardan törədiyi üçün semantikasına və strukturuna görə frazeoloji vahidlərə çox yaxındır. Bu yaxınlıq bəzən onları bir-birindən ayırmağı çətinləşdirir. Görünür, S. Cəfərovun *bel bağlamaq, can atmaq, dil vermək, əl-ayaq etmək, dil açmaq, alt-üst etmək* frazeoloji birləşmələrini mürəkkəb sözlər adlandıraraq onların vaxtilə qovuşma idiomlar kimi işləndiyini diqqətə çatdırması buradan qaynaqlanır [6, s. 90].

Məcazi mənalı mürəkkəb feillərin frazeoloji vahidlərlə eyniləşdirilməsi prosesi Qəzənfər Kazımovun yanaşmalarında sanki təkrarlanır. Tədqiqatçı yazır ki, feillər mə-

caziləşdikdə başqa bir sözlə birləşərək frazeoloji vahid əmələ gətirir və dilin frazeoloji fondu daha çox belə feillərdən ibarətdir. Feili frazeoloji vahidlər mürəkkəb feil hesab olunur. Məsələn: Əsgər bir an *fikrə getdi*; O, tezliklə *hörmətdən düşdü* və s. [11, s. 184 – 185].

Mürəkkəb feilə münasibətdə Y. A. Rubençik fərqli mövqedən çıxış edir: "Dilin bütün semantik, morfoloji və sintaktik xüsusiyyətlərinə malik olan mürəkkəb feil (burada komponentləri məcaziləşmiş birləşmələr nəzərdə tutulur – E. A.) mürəkkəb söz olmayıb, komponentləri söz muxtariyyətini qoruya bilən müxtəlif sabitlik dərəcəsinə malik feili birləşmələrdir" [18, s. 216].

M. Mirzəliyeva yanaşmanın "məntiqdən uzaq" olduğunu göstərir və fikrini belə izah edir: "Y. A. Rubençik mürəkkəb sözlə mürəkkəb feil arasında sədd qoyanda, əslində, feillərin söz olduğunu dolayı yolla inkar etmiş olur. Axı *qaç*, *oyna*, *gül* feilləri, eləcə də *gül, iş* isimləri və *qırmızı* sifəti hər şeydən əvvəl sözlərdir" [14, s. 62 – 63].

Faktların müqayisəsindən aydın olur ki, Y. A. Rubençik (M. Mirzəliyevanın dediyindən fərqli olaraq, hər cür mürəkkəb feili yox) yalnız komponentləri söz muxtariyyətini qoruya bilən müxtəlif sabitlik dərəcəsinə malik feili birləşmələri feil hesab etmir. Bu da tam məntiqlidir.

M. Mirzəliyeva fikrini davam etdirərək hər bir hissəsi müstəqil vurğusunu saxlayan (mürəkkəb isim, mürəkkəb sifət və mürəkkəb zərfdən fərqli olaraq) və digərlərindən qısa pauza ilə ayrılan birləşmələri mürəkkəb feil adlandırır və mülahizəsini isbat etmək üçün mürəkkəb miqdar saylarının, eləcə də *Qara dəniz*, *Xəzər dənizi* mürəkkəb isimlərinin eyni qaydada formalaşdığını diqqətə çatdırır [14, s. 60 – 69].

Maraqlısı odur ki, alim mürəkkəb sözlərin strukturu ilə tam şəkildə zidd olan həmin xüsusiyyətlərin mürəkkəb sözlərin linqvistik təbiətinə xas bir keyfiyyət olduğunu iddia edir [14, s. 61 – 65].

Əvvəla, qeyd edək ki, *Qara dəniz* və *Xəzər dənizi* birləşmələrini mürəkkəb isim adlandırmaq absurddur. Onlar struktur və semantikasına görə dilin onomastik sisteminə daxil olan mürəkkəb adlardır. Mürəkkəb adları isə hər hansı xüsusiyyətinə görə mürəkkəb isimlərlə müqayisə etmək düzgün deyil. Mürəkkəb miqdar saylarına gəlincə, mürəkkəb adlandırılan bəzi miqdar sayları mürəkkəb sözlərlə uyğunluq təşkil etsə də (məsələn, on beş, yüz on beş və s.), bəziləri mürəkkəb söz strukturundan kənara çıxır. Məsələn, bir miyard iki yüz səksən doqquz milyon iki yüz əlli altı min üç yüz altmış beş sayı dörd sintaqmdan ibarətdir. Belə sintaqmatik əlaqə tərkiblərə xas olmaqla mürəkkəb söz hüdudlarını aşır. Ona görə də mürəkkəb miqdar saylarını onun spesifikasını nəzərə alaraq, *tərkibi miqdar sayları* adlandırmaq daha dəqiq elmi yanaş-

ma olardı.

Aparılan araşdırmalarda frazeoloji vahidlərlə məcazi mənalı mürəkkəb sözlərin (mürəkkəb feillərin) eyniləşdirilməsi təsnifat prosesində onları fərqləndirən əlamətdar cəhətlərin diqqətdən kənarda qalması ilə bağlıdır.

M. Adilov bu barədə geniş məlumat verərək yazır ki, dildə olan bütün sözlər iki momentlə (mülahizə ilə – E. A.) müəyyən edilir:

1. Sözün məna momentliyi (daxili momentlik).
2. Sözün texniki momentliyi (xarici momentlik).

Tipik və şübhəsiz bir sözü aldıqda görmək olur ki, onun tamlığı iki vəziyyətdə müəyyən edilir: onun semantikasının tamlığı və onun tam formalaşması. Bütün söz ekvivalenti – sabit birləşmələr məna momentliyi ilə fərqlənir. Texniki planda isə sabit birləşmələr ancaq "ayrıca formalaşmışdır", yəni bunlar xarici əlaqədən məhrumdur [1, s. 42].

Mürəkkəb söz dedikdə, bir neçə (ən azı iki) müstəqil lüğəvi mənaya malik olan sözün tam formalaşmış bir vahiddə birləşməsini anlayırıq [1, s. 44]. *Tam formalaşma* mürəkkəb sözün qrammatik (morfoloji, sintaktik), fonetik və qrafik cəhətdən məhz söz kimi formalaşmasıdır.

Əlbəttə, mürəkkəb sözün hər quruluş tipi üçün bu əlamətlərin hamısının birlikdə mövcud olması zəruri deyildir. Bir halda bu, başqa halda digər və ya bütün əlamətlər birlikdə iştirak edə bilər [1, s. 47].

Mürəkkəb sözləri (feilləri) feili frazeoloji vahidlərdən fərqləndirən xüsusiyyətlər aşağıdakılardır:

1. Mürəkkəb sözlər nominativ vahid olaraq ad bildirir, frazeoloji vahidlər isə ikinci dərəcəli nominasiya vahidi kimi ad yox, münasibət bildirməyə xidmət edirlər [15, s. 541].
2. Mürəkkəb sözlərin komponentləri sabit söz sırasına malik olur. Sıra pozulduqda mürəkkəb söz ya əvvəlki mənasını itirirərək (anlaşılmaz) mənasız söz yığınına çevrilir (məsələn, ayaqqabı sözünün komponentlərini dəyişdikdə əvvəlki məna itdiyi kimi), ya da təsadüfi halda yeni mənalı ismə çevrilir (Ağəli – Əlağa). Ancaq feili frazeoloji vahidlərin komponentlərinin yeri dəyişə bilir. Məsələn: *Gəlməsin zavala* elin sərvəti (B. Vahabzadə).
3. Mürəkkəb sözlərin komponentləri arasına başqa sözlər artırmaq olmur. Feili frazeoloji vahidlərin isə əksəriyyətinin tərəfləri arasına bir və ya bir neçə söz artırmaq mümkündür və bu onun ümumi mənasına xələl gətirmir. Məsələn: Dünən gecə atanın *qəlbi* oğlundan sanki birdəfəlik *sındı*; Uşaqların *ayağı* da ana evindən *kəsilmişdi*;

Kimsə *qaraltmasın* daha *qanımı*; *Salma* özünü bir belə *gözdən*; Əsgər *yola* bu gün yox, sabah *düşəcək* və s.

4. Feili frazeoloji vahidlər yenidən leksikləşə bilər. Məsələn: *Ət tökmək – əttökən (söhbət).*

5. Mürəkkəb sözlərdən fərqli olaraq, feili frazeoloji vahidlərin birinci komponenti, əsasən, şəxslər üzrə dəyişə bilir. Məsələn: *ürəyimə yatmaq, ürəyinə yatmaq, ürəyinizə yatmaq* və s.

6. Mürəkkəb sözlər konkret mənaya malik olduqlarından, dildə onların variantı yoxdur. Mürəkkəb sözlərlə müqayisədə feili frazeoloji vahidlərin müəyyən qisminin variantları vardır. Məsələn: *abrını tökmək, abrını ətəyinə bükmək, abrını vermə*k və s.

7. Bütün feili frazeoloji vahidlərin hamısına xas olan bir əlamət onları mürəkkəb sözlərdən daha kəskin fərqləndirir. Bu da komponentlərin öz heca vurğusunu saxlamasıdır [3, s. 59 – 61].

8. Frazeoloji vahidlərdən fərqli olaraq, məcazi mənalı mürəkkəb sözlər sözün əsasını təşkil edir və yeni leksik vahidlərin əmələ gəlməsində vasitə rolunu oynayır. Məsələn: *acgöz-lük, dilazar-lıq* və s.

A. Bəşirova dilçilikdə mürəkkəb feilləri feili frazeoloji vahidlərdən fərqləndirən belə səciyyəvi xüsusiyyətlər əsasında mürəkkəb feillərə aid edilən *kef çəkmək, car çəkmək, zəhlə tökmək, dərd çəkmək, xərc çəkmək, qol çəkmək, meyil salmaq, acığı tutmaq, qıdığı gəlmək, hirsi tutmaq, paxıllığı tutmaq, nəzərdə tutmaq, fikirdə tutmaq, adı çıxmaq, yalanı çıxmaq, dövran sürmək, vaxt keçirmək* ifadələrini doğru olaraq feili frazeoloji vahidlər sırasına daxil edir [4, s. 49].

Mühakiməni "uğursuz cəhd" adlandıran M. Mirzəliyeva yuxarıda verilmiş misalların hamısını mürəkkəb söz (feil) hesab edir (və ya mürəkkəb feil hesab edənlərlə həmfikirdir) və fikrini müqayisə yolu ilə arqumentləşdirməyə çalışır.

O, A. Bəşirovanın "ürəyimə yatmaq", "ürəyimizə yatmaq" birləşmələrinin birinci komponentinin şəxslər üzrə dəyişə bildiyi üçün frazeoloji vahid adlandırılmasına qarşı çıxaraq bildirir ki, *kömək / köməyimizi / köməyinizi etmək* mürəkkəb feilinin də birinci tərəfi şəxslər üzrə dəyişə bilir [14, s. 66].

Bundan əlavə, A. Bəşirova mürəkkəb feillərdən fərqli olaraq, *ürəyinə düşmək, könlünə düşmək; başa vurmaq, başa çaxmaq* frazeoloji vahidlərinin komponentlərini öz sinonimi ilə əvəz etməyin mümkün olduğunu söyləyir. M.Mirzəliyeva eyni xüsusiyyəti *yardım etmək, kömək etmək* və s. "mürəkkəb feil" adlandırdığı feillərə də şamil edir və fikrini davam etdirərək yazır ki, frazeoloji vahidlərdə olduğu kimi, mürək-

kəb feillərdə də tərəflər arasına sözlər artırmaq mümkündür. Məsələn, *köməyi ona ürəkdən edirəm* [14, s. 67].

Təqdim olunan materialların təhlilindən məlum olur ki, M. Mirzəliyeva mürəkkəb feillərə münasibətdə ənənəvi dilçilikdən kənara çıxmadığı üçün müşahidə olunan çatışmazlıqları nəzərə almır, nəticədə, səhvən mürəkkəb feillər sırasına daxil edilən *kömək etmək, acığı tutmaq, dərd çəkmək* və s. feili frazeoloji vahidləri mürəkkəb feillərin formalaşma qanunauyğunluğunun tələblərinə cavab vermədiyi halda, mürəkkəb feil adlandırır [14, s. 65 – 67].

Əlbəttə, mürəkkəb feillərə struktur-semantik baxımdan yanaşma birmənalı deyildir.

Q. Kazımov *olmaq, etmək, eləmək* feillərinin adlara qoşulmasından yaranan mürəkkəb feillərdən danışarkən (pərt olmaq, dilxor olmaq, parça-parça olmaq) "olmaq" sözünü -*dır* şəkilçisi ilə əvəz etməyin mümkün olduğunu (parça-parçadır, dilxordur, pərtdir), "etmək", "eləmək" sözlərinin isə yarımmüstəqil mürəkkəb feillər (səhv etmək, fikir eləmək, him eləmək) əmələ gətirdiyini göstərir [11, s. 184].

Q. Kazımovun mürəkkəb sözlərlə bağlı qəbul etdiyi yekdil fikir ondan ibarətdir ki, mürəkkəb sözlər iki və daha artıq müstəqil mənalı sözün dildə fonetik, leksik, morfoloji və sintaktik cəhətdən tam formalaşması nəticəsində meydana gəlir.

Belə olduğu təqdirdə, sual yaranır. Tərəflərindən biri yarımmüstəqil olan və ya şəkilçinin mənasına bərabər məna ifadə edən birləşməni hansı keyfiyyətinə görə mürəkkəb feil adlandırmaq olar?

Əsasən, semantikasına görə mürəkkəb feillərə uyğun gəlməyən bu tip birləşmələrlə bağlı tədqiqatçılar daha səmərəli mövqedən çıxış edirlər.

C. Cəfərov adlarla "etmək", "eləmək" köməkçi feillərindən yaranan *fikir eləmək, ifadə eləmək*, adlarla məcazi mənada işlənən "salmaq", "gəlmək", "vurmaq", "düşmək" sözlərindən yaranan *səs salmaq, qərib düşmək, dəhşətə gəlmək* və s. birləşmələrini ənənəvi dilçiliyə uyğun mürəkkəb feillər sırasında versə də, onların mürəkkəb feil olub-olmamasını mübahisəli hesab edir [6, s. 75].

F. Zeynalov bir az da dəqiqləşmə apararaq mürəkkəb feillərə aid edilən *kömək et, tanış elə* birləşmələrini tərkibi feil, *dəhşətə gəlmək, qulaq asmaq* birləşmələrini isə sabit söz birləşmələri adlandırır [6, s. 75].

A. Ələkbərov da yuxarıda verilmiş modellər əsasında qurulan birləşmələrin heç birini mürəkkəb feil hesab etmir [6, s. 75].

Əvvəl qeyd etdiyimiz kimi, dilçilikdə fikir müxtəlifliyinə yol açan məsələlərdən biri də frazeoloji ifadə və ibarə adı altında atalar sözləri, zərbi-məsəllər, hikmətli sözlər, aforizmlər, qanadlı sözlər və tapmacaların frazeoloji vahidlər sırasında təqdim edilmə-

sidir. Mülahizənin ilk baxışda inandırıcı təəssürat yaradan məntiqli səbəbləri vardır. Bunlar frazeologiyanın dil sistemində bir növ sərhədini müəyyən edən sabitlik, idiomatiklik, məna bütövlüyü və monolitlik kimi kateqorial əlamətlərdir. Həmin əlamətlərdən məcazilik dominant mövqeyə malikdir, çünki frazeoloji vahidlər ilk növbədə məcazilik əsasında təşəkkül tapır. M. Mirzəliyevanın dediyi kimi, "frazeologiya məhz məcazi mənadan doğan, ona söykənən və məcazilik üzərində qərar tapıb möhkəmlənən bir dilçilik sahəsidir" [14, s. 31].

Frazeolji vahidlərlə yanaşı, atalar sözləri, zərbi-məsəllər, hikmətli sözlər, aforizmlər, qanadlı sözlər və tapmacalar bu xüsusiyyətlərin bilavasitə daşıyıcıları olduqlarından dilçi-tədqiqatçıların əksəriyyəti onları da frazeoloji vahid adı altında tədqiq edirlər.

H. Bayramov isə qeyd edir ki, atalar sözləri və məsəllərin frazeologiyanın tərkib hissəsi hesab edilməsinin heç bir elmi əsası yoxdur. Bəzi atalar sözlərindəki obrazlılıq da bilavasitə fikrin tərkib hissəsi olmasına gətirib çıxarmır və onda frazeoloji vahidə xas olan keyfiyyət yoxdur [3, s. 44].

Alimin irəli sürdüyü konsepsiya nəzəri cəhətdən məntiqli olsa da, fərqləndirici meyar olaraq obrazlılığı əsas götürməsi absurddur. Ona görə ki obrazlılığa gedən yol məcazilikdən keçir. Məcazilik isə frazeologiyanın başlıca xüsusiyyətlərindən biridir.

Qeyd edək ki, atalar sözləri, məsəllər (və bu kateqoriyadan olan digər vahidlər) frazeologizmlərə xas olan xüsusiyyətlərin daşıyıcıları olmalarına baxmayaraq, frazeoloji vahidlərdən kəskin şəkildə fərqlənirlər. Funksionallığı və struktur-semantik xüsusiyyətlərinə görə frazeoloji vahidlər dilə, atalar sözləri, məsəllər (və bu kateqoriyadan olan vahidlər) isə nitqə aid olan kateqorial vahidlərdir və bu, dilçilikdə heç vaxt dəyişməyən bir qanunauyğunluqdur. Odur ki frazeoloji vahidlər dil, atalar sözləri, məsəllər (və bu kateqoriyadan olan vahidlər) nitq vahidləri olmaqla eyni kateqoriyaya daxil edilə bilməzlər. Təsnifatda bunun diqqətdən kənarda qalması dil və nitqin sərhədinin qarışdırılması anlamına gəlir.

Buradan əldə olunan məntiqi nəticə odur ki, frazeologiyanın tədqiqat obyektinə məcazi mənaya malik hər hansı söz və ya cümlə quruluşlu birləşmələr deyil, dildə hazır şəkildə mövcud olan sabit söz birləşmələri daxildir.

Sabit söz birləşməsi geniş anlayışdır. Frazeologiya onun müəyyən bir qismini əhatə edir. S. N. Muratovun təbirincə desək: "Türk dillərində frazeoloji vahid sabit söz birləşməsidir, lakin hər cür sabit söz birləşməsi frazeoloji vahid deyildir" [16, s. 115].

**Nəticə**

Frazeologizmlərin sabit birləşmələr sistemində mövqeyini dəqiq müəyyən etmək üçün ilk növbədə sabit birləşmələrin məzmununa aydınlıq gətirilməlidir. "Sabit birləşmələrin komponentlərindən biri zəif, yayğın, son dərəcə ümumi semantikası ilə, yaxud tərəflərdən birinin və ya hər ikisinin məcazi mənada işlədilməsi ilə birləşmə komponentlərin ayrılmazlığına səbəb olur" [12, s. 69].

İzahdan aydın olur ki, sabitləşməyə səbəb olan komponentlərin ayrılmazlığı iki şəkildə təmin olunur: a) tərəflərdən birinin zəif, yayğın, son dərəcə ümumiləşmiş semantikaya malik olması ilə; b) tərəflərdən birinin və ya hər ikisinin məcazi mənada işlədilməsi ilə.

Bunlardan birincisi, sabit söz birləşmələrinin sabit leksik birləşmələr, ikincisi, sabit frazeoloji birləşmələr növünü formalaşdırır.

Sabit leksik birləşmələrdə tərəflərdən biri həm qrammatik, həm də leksik məna, digəri yalnız qrammatik məna daşıyır. Məsələn: *Hər tərəf zil qaranlıq idi. Bir qədər havada gəzdikdən sonra yatmaq istəyirdik.* Verilən cümlələrdəki birləşmələrin asılı tərəfi olmadan əsas tərəf heç bir konkret məna ifadə etmir [12, s. 69]. Frazeoloji birləşmələrdə isə tərəflərdən biri və ya hər ikisinin məcaziləşməsi frazeoloji vahidləri formalaşdırır. Deməli, sabit söz birləşmələrinin digər formaları ilə müqayisədə frazeoloji birləşmələrdə sabitliyi təmin edən məcazilikdir.

**Ədəbiyyat**

1. Adilov, M. (2010). *Əsərləri*. I cild. Elm və təhsil.
2. Adilov, M., Yusifov, G. (2019). *Sabit söz birləşmələri* (müəllimlər üçün vəsait). Elm.
3. Bayramov, H. (1978). *Azərbaycan dili frazeologiyasının əsasları*. Maarif.
4. Bəşirova, A. Q. (1984). Müasir Azərbaycan dilində frazeoloji vahid və mürəkkəb feillərin tədrisinə dair. *"Azərbaycan dili" məcmuəsi*, Respublika elmi-metodik konfransının materialları.
5. Cəfərov, C. (2016). *Müasir Azərbaycan dili* (Leksikologiya, morfologiya, sintaksis məsələləri).
6. Cəfərov, C., Abdullayev, N. (2004). *Müasir Azərbaycan dilinin morfologiyası*.
7. Cəfərov, S. (2007). *Müasir Azərbaycan dili* (leksika). Şərq-Qərb.

8. Dəmirçizadə, Ə. (1962). *Azərbaycan dilinin üslubiyyatı*. Azərtədrisnəşr.
9. Əfəndiyeva, T. (2001). *Azərbaycan ədəbi dilinin üslubiyyat problemləri*. Elm.
10. Xəlilov, B. (2008). *Müasir Azərbaycan dilinin leksikologiyası.*
11. Kazımov, Q. (2014). *Müasir Azərbaycan dili* (morfologiya). Elm və təhsil.
12. Kazımov, Q. (2010). *Müasir Azərbaycan dili* (sintaksis). Elm və təhsil.
13. Qurbanov, A. (2010). *Müasir Azərbaycan ədəbi dili.* I cild.
14. Mirzəliyeva, M. (2009). *Türk dillərinin frazeologiyası*.
15. Seyidov, Y., Abdullayev, Ə., Məmmədli, A. (2014). *Azərbaycan dilinin funksional qrammatikası: söz birləşmələri, tabeli mürəkkəb cümlələr, frazeologiya*. IV cild.
16. Muratov, S. N. (1961). *Ustoychvyye slovosochetaniya v tyurkskikh yazykakh.*
17. Vinogradov, V. V. (1947). *Ob osnovnykh tipakh fraziologicheskykh yedinits v russkom yazyke.*
18. Rubenchik, Yu. A. (1981). *Osnovy fraziologii persidskogo yazyka*.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 41–47
https://doi.org/10.48445/h6744-5994-3636-y

# İbtidai siniflərdə müasir Azərbaycan dili dərslərinin ənənəvi təlimlə müqayisəsinin əsas istiqamətləri

***Könül Məmmədova*** [1]

**XÜLASƏ**
*Məqalədə ibtidai siniflərdə müasir Azərbaycan dili dərslərinin ənənəvi təlimlə müqayisəsinin əsas istiqamətlərindən bəhs olunur. Belə ki, Azərbaycan dili müəllimləri şagirdlərin dərin biliklərə yiyələnmək imkanlarını nəzərə alaraq, onlarda fənnə aid anlayışları anlamaq, mühakimə yürütmək bacarıqlarını formalaşdırmağa çalışırlar. Müasir Azərbaycan dili dərslərində şagirdlərin müstəqil düşünmə bacarığını formalaşdıran problemli suallara, düşündürücü çalışmalara daha çox yer verilməlidir. Ənənəvi dərsdən fərqli olaraq, müasir dərs prosesi müəllimlərdən ciddi hazırlıq tələb edir. Bu səbəbdən müəllim dərsdə hansı üsul və priyomlardan istifadə edəcəyini, motivasiyadan, mövzuya aid köməkçi materiallardan və texnologiyadan yerində istifadəni əvvəlcədən müəyyən etməlidir. Müasir dərsin əsas məqsədi şagirdlərin dərketmə qabiliyyətini inkişaf etdirmək, dünyagörüşünü artırmaq və onları təxəyyül müstəqilliyinə yiyələndirməkdir.*

**AÇAR SÖZLƏR**
*müasir dərs, ənənəvi dərs, dərketmə qabiliyyəti, dünyagörüşü, təxəyyül müstəqilliyi, yeni texnologiyalar*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 02.01.2025
Qəbul edilib: 11.03.2025

[1] Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
https://orcid.org/0000-0001-8664-4912 | könül.1970@mail.ru

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 1 / 41–47
https://doi.org/10.48445/h6744-5994-3636-y

# Main Directions of Comparison of Modern Azerbaijani Language Lessons with Traditional Teaching in Primary Classes

***Konul Mammadova*** [1]

**ABSTRACT**
*The article talks about the main directions of comparing modern Azerbaijani language classes with traditional teaching in primary classes. Thus, taking into account the possibilities of students to acquire deep knowledge, Azerbaijani language teachers try to form students' ability to understand concepts related to the subject and make judgments. In modern Azerbaijani language classes, more space should be given to problematic questions and thought-provoking studies that form students' independent thinking. Unlike the traditional lesson, the modern teaching process requires serious preparation for the lesson from the teachers. For this reason, the teacher must determine in advance what methods and principles he will use in the lesson, motivation, and the use of auxiliary materials and technology on the spot. The main goal of the modern lesson should be to develop students' understanding, increase their worldview, and create an opportunity for them to have independence of imagination.*

**KEYWORDS**
*modern lesson, traditional lesson, comprehension ability, worldview, independence of imagination, new technologies*

**ARTICLE HISTORY**
Received: 02.01.2025
Accepted: 11.03.2025

[1] Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0000-0001-8664-4912 | konul.1970@mail.ru

 

## Giriş

*Ana dilimiz müstəqil Azərbaycanın, Azərbaycan xalqının ən böyük milli sərvətidir.*

Heydər Əliyev.

Müasir təhsildə məktəblərdə Azərbaycan dili əsas fənn kimi tədris olunur. Məlumdur ki, hər bir şagird öz ölkəsinin həqiqi vətəndaşı olmaq üçün öncə ana dilini dərindən öyrənməlidir. Bir insan hesab əməllərini və ya fizika qanunlarını bilməyə bilər, amma ana dilini öyrənməsə, o dildə sərbəst və qüsursuz danışa bilməz. Uşaqlarımızın ilk dəfə danışmağa başladığı dil – ana dilidir. Ana dili uşağın ailəsi, cəmiyyəti və həmin ölkənin mədəniyyəti ilə qurduğu ilk əlaqədir. Ana dilində danışmaq, onu mənimsəmək hər bir Azərbaycan vətəndaşının mənəvi borcudur. Öz dilini bilməyən insan başqa dilləri öyrənə bilməz. Dilimiz mənəviyyatımızdır, onun qayğısına qalmaq isə bizim borcumuzdur.

Müasir dövrdə məktəbin əsas və ən başlıca vəzifələrindən biri konkret elmlər üzrə biliklərin verilməsi prosesində öyrənənlərin idraki qabiliyyətlərinin inkişaf etdirilməsidir. İnkişafın başlıca məqsədi şagirdlərin yeni bilik əldə etməsi və mövcud biliklərini möhkəmləndirərək praktikada tətbiq edə bilməsidir. Gözlənilən nəticəni əldə etmək üçün effektli üsullardan istifadə etmək lazımdır. Bu günün tələbi yüksək təfəkkürlü şagirdlərin tədqiqatçılıq bacarıqlarının inkişaf etdirilməsi və dəyərləndirilməsidir. Bunun nəticəsi olaraq, orta məktəblərdə tədqiqatçılıq qabiliyyəti ilə seçilən şagirdlərlə məqsədyönlü işlər aparılır. Belə şagirdlərin dərin biliklərə yiyələnmək imkanlarını nəzərə alaraq, Azərbaycan dili müəllimləri onlarda fənnə aid anlayışları anlamaq, mühakimə yürütmək bacarıqlarını formalaşdırmağa çalışır, öyrətdikləri biliklərin möhkəm təməl üzərində qurulması üçün ən vacib üsul və metodlardan faydalanırlar. Öyrənənlərin potensial imkanlarının üzə çıxarılmasında əsas iş müəllimlərin üzərinə düşür. Belə ki, fənni tədris edən müəllim yetərli pedaqoji ustalığa malik olmalı, şagirdlərlə ünsiyyətdə çətinlik çəkməməlidirlər. Nəzərə almaq lazımdır ki, şagirdlərdə nitq qabiliyyətinin formalaşması məhz ibtidai sinfin ilk dövrlərinə təsadüf edir. Beləliklə, müəllimlər şagirdlərin tədqiqatçılıq qabiliyyətlərini üzə çıxararkən, əslində, onların digər keyfiyyətlərinin inkişafına da müsbət təsir göstərirlər.

**Əsas hissə**

İbtidai siniflərin Azərbaycan dili dərslərində şagirdlərin müstəqil işləmə, fikrini sərbəst ifadəetmə, beyin fəaliyyəti, nəticə çıxarmaq kimi lazımi keyfiyyətləri sürətli inkişaf etdirmək vacib məsələlərdəndir. Buna görə də Azərbaycan dili dərslərində kiçikyaşlı məktəblilərin zehni fəallığını daima aktiv saxlamaq tələb olunur. Bu baxımdan fəal/interaktiv təlim metodlarının təlim prosesinə daxil olması, sözün əsl mənasında, zəruridir. Çünki tələb olunan işləri yerinə yetirməkdə fəal təlim metodlarının rolu əvəzedilməzdir.

Tədris prosesində yalnız bir metod və ya üsuldan yararlanmaq özünü doğrultmur. Ona görə də müəllim mövzuya, sinfin səviyyəsinə uyğun metodların seçilməsinə xüsusi diqqət yetirməlidir. Bu zaman isə, təbii ki, şagirdlərin yaradıcı təfəkkürünü, tədqiqatçılıq qabiliyyətini inkişaf etdirən metodlara üstünlük verilməlidir [4].

Azərbaycan dili fənni mövzuları müqayisəli şəkildə öyrənməyi sevir. Bu baxımdan, şagirdlərdə tədqiqatçılıq bacarıqlarının inkişaf etdirilməsində müqayisə əhəmiyyətli rola malikdir. Hər hansı bir mövzunu öyrənərkən şagirdlərin sərbəst formada araşdırma aparması, digər mövzularla oxşar və fərqli cəhətləri müqayisə etməsi onlarda tədqiqatçılıq bacarıqlarının inkişafına səbəb olur. Bu prosesdə müəllimin üzərinə düşən əsas vəzifə, şagirdlərin tədqiqatçılıq bacarıqlarını müşahidə edib qiymətləndirməkdir. Bunun üçün isə müəllimdən pedaqoji tədqiqat metodlarını dərindən bilmək tələb olunur [2, s. 18 – 22].

Ənənəvi təlim dedikdə, lövhə qarşısında dayanıb dərs izah edən müəllim və onu sakitcə dinləyən şagirdlər göz önünə gəlir. Bu təlim prosesində şagirdlərin bilik qazanması üçün yalnız müəllim və dərslik kifayət edirdi. Lakin bu gün bilik əldə etmək üçün çox sayda mənbələr mövcuddur. Ona görə də əvvəlki mənbələr yeni mənbələrlə müqayisədə bəsit görünür. Belə ki, "öyrənməyi öyrətmək" müasir təlimin əsas vəzifələrindən biridir. Ənənəvi təlimdə şagirdlər əlavə sual vermir (bəzən müəllimin reaksiyasından çəkinib sual verməyə ehtiyat edir), şagirdlərə obyekt kimi yanaşılır, nəticədə isə passiv dərs mühiti yaranırdı. Hazırda – müasir dərsdə isə şagirdlərə subyekt və müstəqil şəxs olaraq yanaşılır, açıq dərs mühiti təşkil olunur. Şagirdlər bilmədiklərini öyrənməkdən çəkinmir, rəqabət aparır, fəallıq göstərir, özlərinə güvənirlər. Onlar özlərini qiymətləndirməyi bacarır, ən əsası isə araşdırmaya meyilli olurlar.

Müasir dərsdə təlimin aşağıda qeyd edilən 7 prinsipindən istifadə olunur:

1. Şəxsiyyətə yönəlmiş təlim prinsipi.
2. Fəal idrak prinsipi.
3. Təlim-tərbiyə sisteminin çevikliyi prinsipi.
4. İnkişafetdirici təlim prinsipi.

5. Qabaqlayıcı təlim prinsipi.
6. Əməkdaşlıq prinsipi.
7. Dialoji təlim prinsipi [1, s. 9].

Tədqiqatlar sübut edir ki, müasir təlim prosesi üçün aşağıda qeyd olunanlar daha səciyyəvidir:

- müəllimin səyi və fəallığı nəticəsində şagirdin yaradıcı fəallığa cəlb edilməsi;
- şagirdin aktiv fəaliyyəti və bu zaman ona elementar bacarıqların aşılanması;
- müəllimlə şagirdlərin və şagirdlərin bir-biri ilə əməkdaşlığı;
- hərəkətli, süjetli-rollu, musiqili-didaktik rollu oyunlardan istifadə, sosial bərabərliyin və psixoloji şəraitin yaradılması;
- müəllimin təqdim etdiyi tematik materialın şagirdin yaradıcı təfəkkürünə təsir etməsi;
- milli düşüncə tərzinin şagirdin formalaşmasına təsir etməsi.

Müasir təlim öyrənənlərə bir sıra bacarıqları qazandırmalıdır. Onlar aşağıdakılardır:

- müstəqil düşünmək, sərbəst fikir söyləmək;
- öz təcrübəsini və biliyini təhlil etmək;
- özünü qiymətləndirmək;
- əməkdaşlıq etmək (başqaları ilə işləməyi bacarmaq);
- başqalarını dinləmək, müxtəlif fikirlərə hörmət etmək və dözümlü olmaq;
- öz fikirlərini arqumentlərlə izah və sübut etmək;
- kreativ düşünmək [5].

İbtidai siniflərdə Azərbaycan dili dərslərində qarşıya qoyulan məqsədlər aşağıdakı istiqamətdə olmalıdır:

- müəllimin şüurlu təfəkkür, problem situasiyasını yaratması;
- problemli situasiyanın həlli prosesində öyrənənlərin tədqiqatçılıq mövqeyinin yaradılması;
- onlar üçün yeni olan biliklərin sərbəst kəşfi və əldə olunması üçün imkan yaradılması.

Müasir dərsdə şagird tədqiqatçı, kəşfçidir, artıq ona aid olan məsələlərdə problemi müstəqil şəkildə həll edə bilir. Bu prosesdə şagirdlər təlimin fəal üzvü kimi tədqiqatçı mövqeyindən çıxış edərək, axtarış prosesində bilikləri mənimsəyirlər.

Fəal təlim metodunun özünə aid bir neçə xüsusiyyəti var ki, bunlar ənənəvi təlimdə istifadə olunmurdu. Məsələn:

**Fəal təlim:**

- təlimdə subyekt-subyekt münasibəti;

- şagirdlərin tədqiqatçılıq mövqeyi, müstəqillik;
- dərsdə bütün şagirdlərin aktivliyi;
- dərsin başlanğıcında motivasiyanın qurulması;
- şagirdlərin yeni biliklər kəşf etməsi məqsədilə düşündürücü və maraqlı sualların verilməsi;
- dərsdə dialoji nitqin qurulması, qarşılıqlı əlaqələrin yaradılması;
- birgə fəaliyyət.

**Ənənəvi təlim:**

- təlimdə subyekt-obyekt münasibəti,
- dərsdə yalnız müəllimin fəallığı,
- dərsin ev tapşırıqlarının yoxlanması ilə başlaması,
- şagirdlərin qiymət xatirinə canfəşanlığı [5].

İnteraktiv təlim metodu təlim prosesində ortaya çıxan dialoq, ideya və əməkdaşlıqdan ibarətdir. Yəni bu metod əvvəlcədən planlaşdırılmayaraq iştirakçıların sərbəst müdaxiləsi ilə baş verir. Digər bir tərəfdən bu metod şagirdlərin öz aralarında da yarana bilər. Əsas məsələ odur ki, bu prosesdə müəllim və şagirdlər eyni mövqedə dayanırlar. Fəal təlim – tədris prosesində yaranan öyrənənlərarası ünsiyyəti, əməkdaşlığı, birgəliyi nəzərə alır. Fəal təlim metodları isə dərs prosesində şagirdlərin öyrənmə, bacarıqlara yiyələnmə üsul və formalarını müxtəlif yanaşmalar əsasında həyata keçirən vasitədir.

Müasir Azərbaycan dili dərslərində şagirdlərin müstəqil düşünmələrini təşkil edən problemli suallara, düşündürücü çalışmalara daha çox yer verilməlidir. Bu cür dərslər şagirdlərin vərdiş və qabiliyyətlərini inkişaf etdirir. Müasir dərsin məqsədi şagirdlərin dərketmə qabiliyyətini inkişaf etdirmək, dünyagörüşünü artırmaq, təxəyyül müstəqilliyini formalaşdırmaqdan ibarətdir. Müasir dərsin qarşısında məqsəd qoyulan digər bir məsələ də təlimlə tərbiyənin vəhdətidir. Hər şeydən əlavə, müasir dərs şagirdlərin əxlaqının təkmilləşdirilməsinə, mənəviyyatın dərkinə, vətənə, anaya, əməyə sevgi ruhunda inkişafına şərait yaratmalıdır [3, s. 78].

Müasir təlim metod və formalarından istifadə təlim prosesini xeyli məhsuldarlaşdırır, dərsi bütün şagirdlər üçün maraqlı edir, təlim prosesində aktivliyi maksimum dərəcədə qaldırır və beləliklə də, təlimin inkişafetdiriciliyi artır. Dərs prosesində fəal təlim metodlarının tətbiq olunması durmadan dəyişən müasir dövrdə fəaliyyət göstərmək, əməkdaşlıq etmək, nəticə çıxarmaq, qərar vermək və s. bacarıqlardan bəhs edən kompetensiyaların yaranması ümumi təhsilin məqsədlərinə yeni yanaşmanı əks etdirir. Metodik, psixoloji və pedaqoji baxımdan təkmilləşdirilmiş müəllimlər innovasiyanın nədən ibarət olduğunu başa düşür, verilən tələblərdən istifadə

etməklə onu tətbiq edirlər. Müəllimlərin həmkarlarının dərslərini müşahidə etməsi, təcrübəli müəllimlərin açıq dərslər təşkil etməsi nümunə baxımından faydalıdır. Çünki onlar dinlənilən dərslərə tənqidi yanaşaraq yeni tədris üsulları yaratmağa nail olurlar.

Fəal dərs elə təşkil olunmalıdır ki, öyrənənlər məlumatı tədqiqat aparmaqla əldə etsinlər. Qeyd olunduğu kimi, tədqiqatın aparılmasında daha çox qrup və cütlər formasından istifadə olunur. Bu yolla şagirdlər çıxarılan nəticəni iş dəftərlərində qeyd edir, daha sonra isə onu təqdim edirlər. Təqdimatdan sonra nəticələr arasında əlaqə yaradılır və ümumiləşdirilir. Çıxarılan yekun nəticə ilə işin başlanğıcındakı ilkin biliklər müqayisə edilir. Tədqiqatçılar nələrin eynilik təşkil etdiyini və ya yeni olduğunu nəzərdən keçirir, mövzuya uyğun motivasiya qururlar.

**Nəticə**

İnteraktiv təlimin üstünlüklərinə baxmayaraq, müəllim tədris prosesindən ənənəvi metoddan istifadəni bütövlüklə çıxarmamalıdır. Müəllimin seçimi dərsin məqsədindən və öyrənənlərin hazırlığından asılıdır. Ənənəvi dərs prosesində də düşündürücü suallar vermək, fikir mübadiləsi aparmaq mümkündür.

Tədris prosesində müasir təlim texnologiyalarından istifadə etməklə, ənənəvi təlim sistemini dəyişərək tədqiqat xarakteri vermək, məlumatın mənimsənilməsi prosesində öyrənəni əsas rola qoymaq mümkündür. Həyat və cəmiyyət arasında əlaqə qurulmazsa, öyrənilən bilgilər öyrənənlər üçün artıq yükə çevrilər. Bu zaman şagirdlərin elmi biliyə marağı azalar. Bu səbəbdən də müəllimlər mövzunu həyatla əlaqəli şəkildə izah etməlidirlər. Məlum məsələdir ki, şagirdlər ənənəvi təlim prosesində qeyri-aktiv şəkildə müəllimin ötürdüyü bilikləri əzbərləyirlər. Bu da onların təlim prosesinin tam hüquqlu üzvü olmaq əvəzinə, təlim prosesinin obyektinə çevrilməsinə səbəb olur. Bütün bu boşluqların aradan qaldırılmasında fəal təlim metodlarından istifadə etmək daha məqsədə müvafiqdir.

**Ədəbiyyat**

1. Veysova, Z. (2007). *Fəal/interaktiv təlim* (müəllimlər üçün vəsait).
2. *Ümumtəhsil məktəblərinin I – IV sinifləri üçün fənn kurikulumları.* (2008). Təhsil.
3. Cəfərova, N. (2016). *İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi*. I hissə. ADPU-nun mətbəəsi.
4. Azərbaycan müəllimi. https://www.muallim.edu.az/
5. Bakı Dövlət Universiteti. http://static.bsu.az

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 48–55
https://doi.org/10.48445/l5272-1496-6603-z

# Mirzə Şəfi Vazehin yaradıcılıq irsi

***Aləmzar Tağıyeva*** [1]

**XÜLASƏ**
*Müəllif məqalədə, əsasən, şairin həyat və yaradıcılığı ilə bağlı mübahisəli məsələlərə diqqət yetirir. Tədqiqatçılar arasında fərqli şərhlərə səbəb olan məqamlar arasında aşağıdakıları qeyd etmək olar:*
– *Vazeh – din – ruhanilər*
– *Vazeh və Bodenştedtin müəllifliyi*
– *mahnılar – həcv – nəsr*
*Fridrix Martinin tarixi-etnoqrafik xatirələr kitabı əsasında şair Şərq müdrikliyinin əcnəbi tələbələr arasında yayılmasının təbliğatçısı kimi səciyyələndirilir. Burada ərəb, fars dilini öyrənən alman və ingilis tələbələr var ki, şair bacarıqlı müəllim kimi onlara xüsusi düşüncə tərzi aşılayır. Bu işdə ona "Hikmət açarları" adlı əlyazma dəftəri yardımçı olur. Burada təqdim olunan bədii nümunələr onlara öz ifadələrini formalaşdırmağa kömək edir. Mirzə Şəfinin Almaniyada nəşr olunmuş şeir və mahnılar toplusu ilə bağlı qarşıdurmada müəllif vəziyyətin uzaqgörənliyini açıq-aydın sübut edən tədqiqatçıların fikirləri ilə razılaşır.*

**AÇAR SÖZLƏR**
*nəsr, nəzm, dil-ədəbiyyat müəllimi*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 17.12.2024
Qəbul edilib: 18.02.2025

---

[1] Pedaqoji elmlər üzrə fəlsəfə doktoru, dosent, Milli Elmlər Akademiyasının Gəncə Bölməsi, Nizami Gəncəvi Mərkəzi. Azərbaycan. https://orcid.org/0000-0002-3208-8145 | alamzar@inbox.ru

 

*Преподавание Азербайджанского языка и литературы*
2025 / Том 71, Номер 1 / 48–55
https://doi.org/10.48445/l5272-1496-6603-z

# Творческое наследие Мирзы Шафи Вазеха

***Аламзар Тагиева*** [1]

**РЕЗЮМЕ**
*В статье автор преимущественно акцентирует внимание на спорных вопросах, связанных с жизнью и творчеством поэта. Среди вызывающих у исследователей разное толкование моментов выделяются следующие:*
– *Вазех – религия – духовенство*
– *авторство Вазеха и Боденштедта*
– *песни – юморески – проза*
*Основываясь на историко-этнографической книге воспоминаний Фридриха Мартина, поэт характеризуется поборником распространения восточной мудрости среди учеников иностранцев. Тут изучающие арабский, фарси немцы, англичане, которых поэт как способный учитель приучает особому строю мышления. В этом деле подспорьем является его рукописная тетрадь «Ключи от мудрости». Художественные образцы, представленные здесь, помогают им формировать собственные высказывания. В авторском противостоянии по поводу изданного в Германии сборника стихов-песен Мирза Шафи автор придерживается мнения тех исследователей, что однозначно доказывают надуманность ситуации.*

**КЛЮЧЕВЫЕ СЛОВА**
*проза, поэзия, учитель русского языка и литературы*

**ИСТОРИЯ СТАТЬИ**
Отправлено: 17.12.2024
Принято: 18.02.2025

[1] Доктор философии по педагогических наук, доцент, Национальная Академия Наук Азербайджана Гянджинское Отделение, Центр Низами Гянджеви. Азербайджан.
https://orcid.org/0000-0002-3208-8145 | alamzar@inbox.ru

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 1 / 48–55
https://doi.org/10.48445/l5272-1496-6603-z

# Creative Legacy of Mirza Shafi Vazeh

***Alamzar Taghiyeva*** [1]

**ABSTRACT**
*In the article, the author mainly focuses on controversial issues related to the poet's life and work. Among the moments that cause different interpretations among researchers, the following stand out:*

- *Vazeh – religion – clergy*
- *authorship of Vazeh and Bodenstedt*
- *songs – humoresques – prose*

*Based on the historical and ethnographic book of memoirs of Friedrich Martin, the poet is characterized as a champion of the dissemination of Eastern wisdom among foreign students. Here are Germans and Englishmen studying Arabic, Farsi, whom the poet, as a capable teacher, teaches a special way of thinking. In this matter, his handwritten notebook "Keys to Wisdom" is of help. The artistic examples presented here help them to form their own statements. In the author's confrontation regarding the collection of poems and songs of Mirza Shafi published in Germany, the author adheres to the opinion of those researchers who clearly prove the far-fetched nature of the situation.*

**KEYWORDS**
*prose, poetry, language and literature teacher*

**ARTICLE HISTORY**
Received: 17.12.2024
Accepted: 18.02.2025

---

[1] Doctor of Philosophy in Pedagogical Sciences, Associate Professor, Ganja Branch of the National Academy of Sciences, Nizami Ganjavi Center. Azerbaijan. https://orcid.org/0000-0002-3208-8145 | alamzar@inbox.ru

 

**Введение**

Быстротечность времени и бесконечность искусства, призванного быть зеркалом жизни, это аксиома. Вопрос о творческом наследии Мирза Шафи Кербалаи Садыг оглы Вазеха (1794–1852) в данном сборнике освещается в ракурсе выяснения причин актуальности его мелодичных стихов – песен, прозы, их места в прогрессирующем XXI столетии. Согласно исследованиям вазеховедов, его перу принадлежат дошедшие до наших дней одно месневи, 3-4 газели, 3 такбир и 3 рубаи.

Говоря о художественной своеобразности стихов Вазеха, обратимся к следующей справке: получивший название от слова «lira» один из жанров литературы именно в его поэзии буквально соответствует этимологии термина: исполнение стихов под звуки старинного струнного инструмента, что рисует образ Орфея, барбеда, озана, кобзаря. Так на протяжении времён, начиная с устного народного творчества, создавалась гармония звучащего и письменного поэтического слога с мелодией. Недаром ведь напевные его вирши издавались на Западе под названием «Песни Вазеха».

**Основная часть**

В этом плане проблемным остаётся противостояние «Вазех – Боденштедт», так как нередко оспаривается авторство названного сборника. Основная сумятица в литературоведческих кругах вызвана популярными в Европе воспоминаниями Ф. Боденштедта «Тысяча один день на Востоке». Изданный в сотрудничестве с Берже в берлинской типографии Деккера «Сборник восточных поэтов» включает переводы из Фузули, Хаяма, Вазеха, Бакиханова и многих других. Но, увидев большую востребованность именно образцов вазеховской поэзии, издатели выпустили отдельный сборник «Песни Мирза Шафи Вазеха». Отмечается, что основой книги явилась рукописная тетрадка поэта «Ключи мудрости», прежде подаренная ученику-немцу.

На наш взгляд, неоднозначно мнение профессора З. Аскерли о том, что «в творчестве Ф. Боденштедта, собранного в 12-титомнике, восточный поэт не кто иной, как художественный образ». Такую позицию учёный объясняет значимостью не столько переводческой, сколько «дипломатической» деятельности его в пользу налаживания литературных контактов между Востоком и Западом. С уверенностью оппонируют литературовед А.Тунджай, историк В. Умудлу, исследователь С. Гусейноглу, подчёркивая реальность существования поэта и учителя Вазеха, описанного Боденштедтом в книге своих

же воспоминаний. Дело в том, что участники диспута основываются на архивных материалах из Берлина и на фундаментальных литературоведческих трудах. Считаем, что каждое из гипотез имеет право на существование.

Первые сведения о жизни и деятельности его приурочены к началу XX века и связаны с именем Ф. Кёчарли. Что касается вопроса о роде занятий Мирза Шафи, то согласно сведениям, упомянутым в газете «Кавказ» начала 20-х годов, он позиционируется как «учитель, комментатор (понимается переводчик), каллиграф». Его поэтическая деятельность развивалась позднее. В результате стихотворец стал именно тем Вазехом, художественное наследие которого изучается сегодня.

Наиболее полный материал о жизни, творчестве и гражданской позиции поэта находим в трудах Алиаждара Сеидзаде. Вот полный блок его проблемных исследований в разные годы: 20-е г. – «Вазех», 40-е – «Мирза Шафи или Боденштедт», 1969-й – «Мирза Шафи Вазех», основательная монография на русском языке.

На страницах данного сборника приводятся сведения и об особом стиле ведения урока Мирза Шафи с иностранными учениками, где наряду со стихотворчеством, они приучаются к исполнению сочинённого материала вкупе с мелодией.

Ещё один проблемный аспект в жизни поэта – отношение к религии, духовенству. Родившийся в глубоко религиозной семье, он «не мог позволить себе никакого богохульства. Вазех – гражданин негодовал против глашатаев от имени бога». У юного Мирза Шафи был и духовный наставник Гаджи Абдулла, к которому он испытывал уважение. По нашему мнению, отсюда и двойственность негодования, граничащего с нервозностью: с одной стороны, приютившая отшельника поэта келья в мечети, с другой, «пустомели с воздвигнутыми минаретами взамен тысячи разрушенных очагов».

Поэтому для познания мудрости Мирза Шафи следует изучить царившую в тот период в Гяндже социально – духовную среду. По одну сторону – погрязшее в лицемерии духовенство, по другую – певец красоты, глашатай справедливости.

Носитель литературного псевдонима «Вазех» (с арабского «ясный, открытый») своей бунтарской поэзией занял достойную нишу не только в азербайджанской литературе; «мирза» – образованный; письмоводитель, секретарь, учитель; царевич с приставкой «мирза» после имени; «шафи» – посредник, миротворец. Всей жизнью и творческим наследием поэт оправдал своё имя. Воистину, каким именем нарекут, обычно такой характер и проявится,

такая деятельность состоится, такой путь и пройдёшь по жизни. Непростая судьба Вазеха человека творческого тому пример.

Кажется, что воспевающий красоту волшебной пери, скрывающий душевные искания в блеске бокала поэт, в действительности же мудрец, объявил джихад всему негативному мелодичными своими стихами. Как видим в стихах, в одному ряду с ним пророк Давид, протестная лирика Мехсети. Приняв эстафету, словно незавершённые песни допевает молодой поэт. Корнями его поэзия восходит и к месневи Низами Гянджеви, черпая оттуда широкий взгляд на действительность. Фактически, предвестник будущих изменений в природе, науке и человеческой сути предок шейх Низами подспудно просветил и молодого Вазеха. Хотя он проводил жизнь в мечети, переписывая суры Корана, в то же время внутренне чувствовал грядущие события, протестуя против невежества народа. Как истинный учитель ратовал не только за просвещение детей нации, но и старался, если не сдружить, то познакомить Запад с положительными качествами родного языка через свои восточные напевы и уроки словесности.

Мирза Шафи – учитель, встречавшийся с выходцами из Европы, считал немалым упущением западного воспитания то, что живут они «без убеждений и веры». И по этой причине тоже, привлекал многих слушателей, изучавших у него фарси, к участию литературного меджлиса «Дивани хикмет».

Приближённый к нему любитель восточных языков Ф. Боденштедт в популярном историко-этнографическом трудеподробно описывает деятельность «дарнага» и его идейного вдохновителя Вазеха. Как следует из воспоминаний, цель собраний заключалась в привитии слушателям морально-этических норм Востока.

Будучи методистом, видим из представленного описания чёткую продуманность реализуемой устадом системы обучения. Она включает разнообразные приёмы и способы по привитию иностранцам закономерностей формирования суждений в общем, и восточной, в частности. С учётом обучаемого контингента поэт способствовал практическому овладению ими фарси, арабского и азербайджанского языков, а также постижению глубинных мыслей поэтов и философов незнакомой страны.

Из материала воспоминаний следует, что «устад читал стихи, растолковывал особенности рифм и содержания, внимательно работал над произношением». Он стремился к большей речевой активности класса, при котором «ученики нередко самостоятельно определяли значение арабских слов» [2, s. 30].

Намёки на элементы интерактивного обучения находим в таких дидактичес-

ких приёмах: после образцового мелодичного исполнения стиха устад обязывал «каждого из нас составить мудрое высказывание или пересказать свою версию услышанного» [2, s. 32]. В ответ учитель тут же предложенное выражение трансформировал в очередную песню-стих. Построенные на диалоге учитель-ученик занятия исключали монотонность урока, готовя к спонтанной речи на изучаемом языке. Это определяло прогрессивность кружка в сравнении с косностью зубрёжки в медресе.

Мирза Шафи практиковал как монологи на философско-литературные темы, так и диспуты-полилоги по широкому кругу вопросов: национальные качества народов Запада; гендерное равновесие; рукописные и типографские книги; литературная критика и языковедение.

Его рукописная тетрадь с названием «Ключи от мудрости» являлась и своеобразным дидактическим пособием, материал которого подвергался разным видам чтения (объяснительного, выразительного) и критическому анализу. Другим источником являлись удачные высказывания самих учеников, путём анализа которых достигалась филигранность в дальнейшем сочинительстве изречение и афоризмов.

Вазех помнил и о значимости в обучении физического здоровья учеников и поэтому на переменах устраивал коллективные медитации с исполнением песен. Такая разрядка между напряжённым умственным трудом сказывалась на продуктивности обучения.

И на уроках, и на меджлисах ученики набирались восточному уму на поэтических образцах из Джами, Саади, Хагани, Хафиза, Низами, Физули, не только цитируя их, но составляя образцы по их подобию – а эта имитация тоже путь к совершенству в словесности. При этом устад не претендовал на абсолютную исключительность по части мудрости, называя авторов, давая оценку их мастерства.

По мнению Вазеха, устное народное творчество не менее ценный кладезь мудрости, отражённой в притчах и легендах, пословицах и поговорках, занимательных загадках и скороговорках. «Они, – считает поэт, – раскрывают национальные ценности того или иного народа» [1, s. 43].

Теперь относительно загвоздившего в литературоведении противостоянии Вазех – Боденштедт. Отвергающим данный не факт способно личное высказывание вечного оппонента о том, что «если существовал человек, создавший сокровище из стихов, то это Мирза Шафи Вазех», или «… свою, состоящую из гасид, гпазелей, рубаи и песен к н и г у, являющуюся источником

ума, Мирза Шафи написал для просвещения глупцов и укрепления ума устадов» [2, s. 73-74].

Приведём образцы изречений, афоризмов, цитат Вазеха в нашем переложении:

У неуча знания неглубоки, но аппетит огромен.

Псевдоучителей интересует не обучение, а карман учени.

Часть получишь, а остальное наработаешь сам.

На лжемудрости не вырасти ни пшенице, ни ячменю.

В пучине науки – глубоко содержание, и широкие мысли.

Посеянные семена мудрости взойдут в рассуждениях учеников.

Восточная мудрость для глупцов – это урок, для сбившихся с пути – путеводная звезда

**Заключение**

Мирза Шафи Кербалаи Садыг оглу Вазех личность, характеризуемая глубокими противоречиями не только со своим «я», но и с царившим мракобесием. В итоге он сумел оставить поколениям неповторимые песни и острую художественную сатиру. Литературное наследие Вазеха созвучно той социальной роли, что исполнил он до конца. В одном лице поэт и учитель, открытый к общению миротворец между реальностью и людьми, в то же время скульптор душ человеческих.

**Литература**

1. Aslanov, A. (2004). *Mirzə Şəfi Vazeh. Nəğmələr*.
2. Bayramov, A. F. (2008). *Bodenştedtin Mirzə Şəfi Vazeh haqqında xatirələri*.
3. Bayramov, A. (2008). *Nəğmələr şairi*.
4. Kurbanaliyeva, S. (2014). *Vazekh i muzyka*. Kul'turnaya zhizn.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 56–71
https://doi.org/10.48445/d4012-4568-4806-n

# Jizzax ədəbi mühitinin inkişaf tendensiyaları

***Pərizoda Turopova*** [1]

**XÜLASƏ**
*Məqalədə XX əsr ədəbiyyatı və müstəqillik dövrü kontekstində Cizzax ədəbi mühitinin inkişaf tendensiyaları Cizzax yazıçılarının əsərləri nümunəsində öyrənilmiş, onların spesifik və bədii xüsusiyyətləri, həmçinin ədəbi prosesin ümumi xüsusiyyətləri müəyyən edilmişdir. Tədqiqatın obyekti XX əsrin və müstəqillik dövrünün Cizzax ədəbi mühitinin və Özbəkistan Yazıçılar Birliyinin üzvləri – İ. Doniş, T. Maqsud, A. Əhməd, M.Abduraxmanova, Ş. Axrorova, Z. Mamadəliyeva və şair Z. Buriyevanın əsərləridir. Müqayisəli təhlilə Cizzaxın ədəbi mühitinin formalaşması və inkişafına böyük töhfə verən Muazzamhan, Alamkash, J. Mahzuni, B. Mirzə, H. Olişin əsərləri cəlb edilmişdir. "Bulmas", "Köç", "Vətən şulmasmı?", "Vətəni sevsəng", "OMON əsr" kimi poetik əsərlərdəki ideya-bədii, simvolik-fəlsəfi yozumlar ədəbi-estetik ideallar kateqoriyasına daxildir.*

**AÇAR SÖZLƏR**
*tendensiya, bədii xüsusiyyətlər, ədəbi proses, klassik ədəbiyyat, ənənə, janr quruluşu*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 16.12.2024
Qəbul edilib: 12.02.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, dosent, Cizzax Dövlət Pedaqoji Universiteti. Özbəkistan.
https://orcid.org/ 0000-0002-4800-2828 | turopova.parizod@bk.ru

 

reallığını daha çox qabartması ilə səciyyələnir. Hekayədə vurğulanan digər bir məqam məktəb ətrafında olan mülahizələrdir.

"Müəllim: – Afərin, oğlum! Daha da bilirsənmi?

– Bəli, ən əziz şeylərdən biri və birincisi məktəbdir ki, bizi vəhşilikdən çıxardıb adam edən də budur" [2, s. 6].

Orijinal bir üslub sərgiləyən bu bədii nümunə sonluqda həyat haqqında ümumiləşdirici mülahizələrlə və yüksək təfəkkür intelleksiyasına dayanan sonluqla səciyyələnir.

"Müəllim: – Bəli, həyat üçün mənim fikrim budur ki, həp vətənsiz, millətsiz, elmsiz, dövlətsiz, namussuz həyatın olmaması olmasından daha gözəldir!

Müəllim: – Mərhəba, oğlum, öylədir!" [2, s. 7]

Bütünlükdə bunlar öz məzmunu və ideya səciyyəsi baxımından uşaq tərbiyəsinə, onların təsəvvürlərini əhatələməyə, milli-mənəvi dəyərləri aşılamağa köklənir. Bunların ifadə formaları isə inisial, medial səviyyəsində folklordan gələn zənginlikləri əsas götürməklə prinsipləşir. "Bir-birinə bənzəməyən folklor nümunələri formalaşmağa başladıqca, onların əhatə etdiyi mövzu dairəsi də zaman keçdikcə genişlənmiş, xalqın ideya və fikri öz bədii həllini həmin janrlarda tapmışdır" [6, s. 34]. Ədəbiyyatın yazılı qolu xalq yaradıcılığının ifadə modellərindən bəhrələnməklə uşaqların sirli-sehrli dünyasını əks etdirməyi və onları bir şəxsiyyət kimi tərbiyə etməyi qarşıya məqsəd qoyur.

**Nəticə**

XIX əsrin sonu – XX əsrin əvvəllərinin uşaq nəsri təkcə mövzu mündəricəsi ilə deyil, həm də məzmun xətlərinin poetexnoloji formulası, struktur konstruksiyası ilə xalq ədəbiyyatından gələnləri bir vasitə olaraq prinsipləşdirir. Nağıl, əfsanə, rəvayət, lətifə, təmsil, atalar sözü, məsəl, yanıltmac, uşaq oyunları kontekstində diqqət önünə gələn folklor yaradıcılığı müxtəlif aspektlər vasitəsilə yazılı ədəbiyyat mühitində orijinal düşüncə ilə səciyyələnir. R. Əfəndiyev, S. S. Axundov, A. Şaiq, S.M.Qənizadə, Ş. Əfəndiyeva kimi ədiblərin yaratdığı nəsr örnəkləri sintaktik fiqurların düzümü və formul mükəmməlliyi ilə əsaslı təsəvvür formalaşdırır. Bütün bunlar milli-mənəvi dəyərlərin aşılanması baxımından bir örnəyə çevrilir və məzmun mündəricəsi ilə ədəbi-mədəni prosesin uşaq nəsri müstəvisində dönməzliyini sərgiləyir.

**Ədəbiyyat**


1. *Azərbaycan klassik uşaq ədəbiyyatı antologiyası*. (1998). Elm.
2. Bünyadzadə, C. (1911). Məktəbdə. *"Məktəb" jurnalı*, 3.
3. Əfəndiyev, P. (1992). *Azərbaycan şifahi xalq ədəbiyyatı*. Maarif.
4. Əfəndiyev, R. (2006). *Seçilmiş əsərləri*. Şərq-Qərb.
5. Əfəndizadə, M. (1906). Bağdadlı Cəfərin hekayəti. *"Dəbistan" jurnalı*, 2.
6. Xəlil, Z., Əsgərli, F. (2011). *Uşaq ədəbiyyatı*. ADPU.
7. Məmmədov, M., Salamoğlu, T., Babayev, Y. (1998). *İki əsrin maarif işığında. Azərbaycan klassik uşaq ədəbiyyatı antologiyası.* Elm.
8. Məmmədov, M., Babayev, Y., Salamoğlu, T. (1992). *Pedaqoji mühit və uşaq ədəbiyyatı*. Maarif.
9. Namazov, Q. (2007). *Azərbaycan uşaq ədəbiyyatı*. Bakı Universiteti.
10. Seyidov, Ş. M. S. (1902). *Hekayəti-it və pişik*.
11. Talıbov, Y. R., Ağayev, Ə. A., İsayev, İ. N., Eminov, A. İ. (1993). *Pedaqogika*. Maarif.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 /80–90
https://doi.org/10.48445/x9970-5184-9519-o

# Türk şairi Rəcaizadə Mahmud Əkrəm və Mirzə Ələkbər Sabir yaradıcılığı

***Ulduz Qəhrəmanova*** [1]

**XÜLASƏ**
*Böyük Azərbaycan şairi Mirzə Ələkbər Sabir yalnız Azərbaycan klassik poeziyasını öyrənib onlardan öz satirik məramına uyğun istifadə etməklə kifayətlənməmiş, həmçinin Yaxın Şərq ədəbiyyatının klassiklərini də unutmamışdır. Onun türk və fars klassiklərinə yazdığı nəzirə, bənzətmə, məalən tərcümə və təxmisləri ədəbiyyat tarixində xüsusi mövqeyə malikdir. Məqalədəki müqayisələr göstərir ki, Rəcaizadənin lirik romantizminə Sabir satirik realizmlə cavab vermişdir. Şair Rəcaizadədən götürdüyü nümunələrdən istifadə edərkən mühüm əlamətləri mühafizə etməklə yanaşı, onların üzərində ciddi dəyişikliklər də etmişdir.*

**AÇAR SÖZLƏR**
*Rəcaizadə Mahmud Əkrəm, Mirzə Ələkbər Sabir yaradıcılığı, satira, romantik hiss*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 28.11.2024
Qəbul edilib: 15.02.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https://orcid.org/0009-0003-4418-9319 | ulduzkahraman1@gmail.com

 

*Teaching of Azerbaijani Language And Literature*
2025 / Volume 71, Issue 1 / 80–90
https://doi.org/10.48445/x9970-5184-9519-o

# Creation of Turkish Poet Rejaizade Mahmud Akram and Mirza Alakbar Sabir

***Ulduz Gahramanova*** [1]

**ABSTRACT**

*The great Azerbaijani poet Mirza Alakbar Sabir was not satisfied with only studying the classical poetry of Azerbaijan and using them according to his satirical purpose, he also did not forget the classics of the Middle Eastern world. His poems, similes, translations and interpretations of Turkish and Persian classics have a special position in the history of literature. The comparisons in the article show that Sabir responded to Rajaizade's lyrical romanticism with satirical realism. While using the samples taken from Rajaizade, the poet preserved the important features and made serious changes on them.*

**KEYWORDS**

*Rejaizade Mahmud Akram, Mirza Alakbar Sabir's creativity, satire, romantic feeling*

**ARTICLE HISTORY**
Received: 28.11.2024
Accepted: 15.02.2025

[1] Doctor of Philosophy in Philology, Head Teacher, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0009-0003-4418-9319 | udrizkahraman1@gmail.com

## Giriş

Dahi Azəbaycan şairi M. Ə. Sabir yaradıcılığı öz vətənində olduğu kimi, Türkiyədə də böyük əks-səda doğurmuşdur. Müxtəlif türk mətbuatlarında, ensiklopediya və ədəbiyyat tarixində, antologiya və lüğətlərdə şair haqqında müxtəlif mülahizələrə rast gəlsək də, təəssüflə qeyd etmək lazımdır ki, Türkiyədə onun haqqında ədəbi fikrin gedişi sistemli şəkildə hələ də öyrənilməmişdir. Sabirin Şərq ədəbiyyatı, xüsusilə Şərq ölkələri ilə əlaqəsi geniş və dəyərli bir mövzudur. Tənqidçi alim Ə. Mirəhmədova görə, şairin Orta və Yaxın Şərqin Hindistan, Ərəbistan, Misir, Türkiyə və başqa ölkələrində nə dərəcədə tanındığı tədqiqatçılar tərəfindən hələ də dərindən araşdırılmamışdır.

M. F. Axundova görə, M. Ə. Sabir irsi onun sağlığından bu günə qədər Yaxın və Orta Şərq xalqları arasında geniş yayılmışdır. Bu inkarolunmaz həqiqəti Abbas Səhhətdən başlamış Sabir haqqında yazan bütün ədəbiyyatşünaslar etiraf edirlər. Hətta xarici ölkələrdə çap olunan bir sıra əsərlərdə də “Molla Nəsrəddin” jurnalı və onun böyük şairi Sabirin Yaxın Şərq ölkələrinə qüvvətli təsiri etiraf olunur.

## Əsas hissə

Bu məsələ C. Xəndan, Ə. Cəfər, T. Novruzov kimi ədəbiyyatşünasların diqqətindən yayınmamışdır. Ə. Cəfər bildirmişdir ki, deyilənə görə, Sabir, Rəcaizadənin dörd şeirinə bənzətmə yazmışdır.

1. Sabirin Rəcaizadənin “Növbahar” adlı şeirinə yazdığı “Çığırma, yat...”, yaxud “Töməyi-nəhar” adlı bənzətmə əsəri buna bir nümunədir. Bu iki şeir arasında nə mövzu, nə ideya, nə ruh cəhətdən, nə də üslubca heç bir yaxınlıq yoxdur. Rəcaizadənin şeirində əvvəldən sonadək baharın tərənnümünə yer ayrılır: çiçəklər, quşlar, ağaclar, çəmənlər və çəmənlərdə gəzən gözəl qızlar, son iki misrada isə dərdsiz-qəmsiz çoban qiyafətli bir qərib. “Növbahar” ictimai məzmuna malik olmayan lirik-naturalist bir şeirdir. Halbuki Sabirin buna bənzədilən şeiri başdan-başa ictimai keşməkeşlər və sinfi didişmələrlə dolu bir əsərdir. Burada həm xalqın başı üstündə siyirməqılınc duran çar üsuli-idarəsi, həm əməkçi kütləlfolləri soyan möhtəkir bəylər, xanlar, həm fəqirlərə, yoxsullara kəfən biçən murdar üzlü varlılar, həm riyakar, zəhərli ruhani təbəqəsi, həm avara, boşboğaz, səfih ziyalılar, həm də bütün bu tüfeylilərin ağırlığını çiyinlərində daşıyan məzlum, zəhmətkeş xalq obrazları yaradılıb.

*Rəcaizadə Mahmud Əkrəm:*

Müqimi-rağ ol, ey könül, füyuzi-növbaharı gör!
Şükufələrdə mövc uran səfayi-hüsni-yarı gör!

Nə sənət eylər aşikar həzari-nəğməkarı gör!
Kənari-hövzi-pakdə dirəxti-sayədarı gör!
Verər həyatə ehtizaz, xüruşi-cuybarı gör!

*Mirzə Ələkbər Sabir:*

Çığırma, yat, ay ac toyuq, yuxunda çoxca darı gör!
Sus, ay yazıq, fəzadəki üqabi-canşikarı gör! [4, s. 93]

Bu iki şeir forma cəhətdən də bir-birinə bənzəmir. Birinci, müsəmmət şəkilli beş bəndli bir beşlik, ikinci isə qəzəl şəkilli doqquz beytli bir şeirdir. Deməli, burada iki şeirdən birinin digərinə nəzirə olması üçün tələb olunan əsas şərtlər yoxdur. Lakin, bununla belə, iki şeir arasında vəzn və qafiyəcə oxşarlıqlar mövcuddur. Sabir "Növbahar" şeirinin vəzn və qafiyəsinə uyğun, məzmunca ona zidd bir əsər yaratmaqla Rəcaizadənin şeirini təhzil etmişdir. Yəni Sabirin şeiri Mahmud Əkrəmin şeirinə, "Hophopnamə" naşirlərinin dediyi kimi, nəzirə deyil, təhzildir.

2. "Sabir Rəcaizadə Mahmud Əkrəmin "Yad et!" adlı məşhur şeirinə də nəzirə yazmışdır. Bu şeir 2 iyul 1907-ci ildə "Füyuzat" jurnalının 27-ci nömrəsində çap olunduqdan bir neçə gün sonra "Molla Nəsrəddin" jurnalının haman ildə çıxan 20 avqust tarixli 31-ci nömrəsində Sabirin nəzirəsi çap olunmuşdur" [5, s. 333 – 334].

Sabirin "Vəqta ki, qopur bir evdə matəm" adlı satirası ilk dəfə "Molla Nəsrəddin" jurnalında 20 avqust 1907 № 31-də imzasız çap olunmuş və bütün nəşrlərə daxil edilmişdir. Şeir üçüncü və dördüncü nəşrdə "Ehsan" adı ilə verilmişdir. İstər jurnalda, istərsə də birinci və ikinci nəşrdə şeirdən əvvəl belə bir qeyd vardır: Rəcaizadə Mahmud Əkrəm bəy əfəndi həzrətlərinin "Yad et" ünvanlı əşarına nəzirə" [4, s. 355].

Müqayisə edərkən görünür ki, Rəcaizadə Mahmud Əkrəm bəy əfəndinin şeiri fərdi romantik hisslərin tərənnümünə, Sabirin şeiri isə ictimai satirik ideyaların təbliğinə həsr olunmuşdur. Rəcaizadə Mahmud Əkrəm bəy əfəndi romantik, Sabir isə realist üslubda yazmışdır. Ona görə də biri tərənnüm, o biri ifşa edir. "Birində təbii mənzərə, o birində cəmiyyətin faciəli həyatından canlı bir lövhə nəzəri cəlb edir. Şeirlərin birində kədərli aşiq və onun məhbubəsinin xəyalı, digərində ölüm və onunla əlaqədar olaraq təşkil olunmuş ehsan mərasimlərində iştirak edən və ancaq yemək xatirinə gələn acgöz insanların tipik surətləri canlanır. Nəhayət, hər iki şeirdə təkrar olunan "yad et" rədifinin məzmunu və doğurduğu təəssür də başqadır" [5, s. 335].

*Rəcaizadə Mahmud Əkrəm:*

Vəqta ki, gəlib bəhar...yeksər
Əşyadə əyan olur təğəyyür;
Vəqta ki, həzar eşqpərvər
Yarpaqlar ilə edib təsəttür,

*Mirzə Ələkbər Sabir:*

Vəqta ki, qopur bir evdə matəm,
Təşkil edilir büsati-ehsan,
Məlumlər əyləşir müəmməm,
Təfrih ilə əllərində qəlyan,
Ev sahibinin xəyalı bərhəm,
Əfkarı qonaqların fisincan,
Bişdikcə qazan-qazan mütəncəm,
Gəldikcə tabaq-tabaq badımcan-
Yad et məni, yağlı-yağlı yad et! [4, s. 120]

Romantik hissləri ifadə edən bu şeir bir sənət nümunəsidir. Təsadüfi deyil ki, Sabirlə yanaşı Abbas Səhhət, Abdulla Şaiq və digər şairlərimiz də bu gözəl şeirə nəzirələr yazmışlar. Sabirin qələmə aldığı isə bu nəzirələrin hamısından fərqlənir. O bu lirik şeirdən satirik məqsəd üçün istifadə etmiş, onun lirik-romantik ruhunu tamamilə dəyişdirərək şeirə satirik ruh qatmışdır.

Ə. Cəfərə görə, "Üç bəndlik bu şeirdə üç zümrənin: "rəhmsiz zənginlərin, müftəxor ruhanilərin və ac-yalavac yoxsulların yaşayış tərzi", ümumiləşmiş obrazı oxucunun nəzərində canlanır. Hətta Sabir öz şeirinin ikinci və üçüncü bəndlərindəki son misraları Rəcaizadədən təxmis etməsinə baxmayaraq, bu iki şeir ideya və ictimai məzmunu baxımından da Sabirin parodiya sənətkarlığının mühüm məziyyətidir" [1, s. 15].

Yeri gəlmişkən, onu da qeyd edək ki, Sabirin bu şeiri uzun zaman Rəcaizadə Əkrəmin həmin şeirinə nəzirə hesab edilmişdir. Halbuki, qeyd edildiyi kimi, bu şeiri ("Hophopnamə"nin üçüncü və dördüncü nəşrində "Ehsan" adı ilə çap olunub) "Yad et" şeirinə nəzirə adlandırmaq düzgün olmazdı. Doğrudur, şeirlərin arasında forma bənzərliyi vardır. Hər ikisinin vəzni eynidir: *məf'Ulü*, *MəFA'ilün*, *fə'Ulün* (həcəz bəhrinin onuncu növü), ikisi də şəkilcə müəşşərdir (müsəmmət tiplidir), bəndlərin son misraları eyni, "yad et" sözləri ilə rabitələnir. Lakin Rəcaizadənin şeirinin bütün bəndləri doqquz misradan ibarətdir. Sabir isə bu prinsipə tabe olmamış, onun şeirinin birinci bəndi doqquz, ikinci və üçüncü bəndləri isə on bir misralıdır. Rəcaizadədə bəndlərin son misraları qafiyəsizdir. Sabirdə isə iki sonuncu misra Rəcaizadədən götü-

rülsə də, bu ahəngdar sözlər qafiyə üçün nisbətən məqbul sayıla bilər. Deməli, hər iki şeirdə qafiyə baxımından müəyyən sərbəstliyə yol verilmişdir. Bütün bu cəhətlər hər iki şeirin yalnız formal tərəfini təşkil edir. Məzmun tərəfinə nəzər saldıqda Rəcaizadənin əsəri bir lirik sentimental şairin təbiət lövhələri qarşısında incə və həzin duyğularını, əndişələrini müxtəlif rənglərdə təsvir edir. Sabirin əsəri isə bir realist, mübariz xalq şairinin ictimai həyatda olan kəskin ziddiyyətlər, böyük ədalətsizliklər qarşısında yaşadığı dərin əzablı hiss və fikirlərini bütün çılpaqlığı ilə ifadə edir. Üç bənddən ibarət olan bu şeirdə üç ictimai təbəqənin: rəhmsiz zənginlərin, müftəxor ruhanilərin və ac-yalavac yoxsulların yaşayış tərzi şairin qələminin gücü ilə təsvir edilir. Bu iki şeir ideya və ictimai mündəricə etibarilə yalnız bir-birinə zidd deyil, bəlkə də, ikincisi birincisinə güclü bir satiradır.

Mahmud Əkrəm Rəcaizadənin haqqında danışılan "Yad et!" şeirinə Sabirdən, təxminən, bir il sonra, yəni 1908-ci ildə bir çox şairlər də nəzirə yazmışlar. Bunlardan Abbas Səhhət, Abdulla Şaiq, Məşədi Həbib Zeynalov da "Qızdırmalı" imzası ilə "Aqilanə yad et" adlı bənzətmə yazaraq "Hop-hop"a təqdim etmişdirlər. Ə.Cəfər göstərir ki, bunu həm Sabirə bənzətmə, həm də Rəcaizadəyə təhzil saymaq mümkündür. Sabir isə, "Qızdırmalı"nın bu bənzətməsinə cavab olaraq, "Madam ki, Hamiyani-zülmət" misrası ilə başlayan şeirini yazmışdır. Həm Sabirin, həm də "Qızdırmalı"nın şeirləri ictimai məzmun cəhətdən eyni mahiyyət və eyni üslubludur. Lakin "Qızdırmalı" çirkin, cahil, qaranlıq bir ictimai mühitdən asanlıqla gözəl, cənnət kimi bir aləmə keçir. "Qızdırmalı" da M. Hadi kimi parlaq istiqbaldan danışır, dünyanın cənnətə dönəcəyinə inanır, Sabir isə həyat hadisələrinə daha açıq gözlə baxır. Şair dərk edir ki, "Qızdırmalı"nın görüb duyduğu yaralar asanlıqla və tezliklə sağala bilməz. "Kafir sözünün lüğətdən silinməsi, mollanüma mirzə qənbərlərin aradan qaldırılması, habelə adət şəkli alan bir sıra yaramazlıqların sıradan çıxması bu günün və sabahın işi deyildir. "Bu nöqtəni qanə-qanə xab et!" − deyən şairin mənalı ifadəsindəki ictimai motiv oxucunu xəyallara daldırır, düşündürür və hətta mübarizəyə ruhlandırır" [5, s. 328 – 329].

*Qızdırmalı:*

Vaxta ki, cahanda ləfzi-kafər
Bir-bir pozular hamı lüğətdən,
Nə Mollanüma, nə Mirzə Qənbər,
Yox, rənci məlal bir cəhətdən
İnsanlar olur çü cismi-vahid,
Aləm dəxi bir vətən ki, cənnət...

*Sabir:*

Aldanma quzum ki, ləfzi-kafər
Təshih olunub çıxa lüğətdən;
Madam ki, sağı Mirzə Qənbər,
Eymən deyilik bu mələnətdən;
Qoymaz ki, bu xəlqi cismi-vahid
Hökmündə olub edə məişət [4, s. 157].

Sabir "Qızdırmalı" imzası ilə yazan M. H. Zeynalova "Madam ki, Hamiyani-zülmət" adlı satirası ilə cavab vermişdir. Bu satira ilk dəfə "Molla Nəsrəddin" jurnalının 1908-ci il 30 mart tarixli 13-cü sayında imzasız çap olunmuş və dördüncü nəşrdən başqa, qalan bütün nəşrlərə daxil edilmişdir. Şeir üçüncü nəşrdə "...Qafilanə xab et!" adı ilə verilmişdir. Jurnalda şeirdən əvvəl belə bir qeyd vardır: "Molla Nəsrəddin"in 10-cu nömrəsində "Qızdırmalı" imzalı yazılan əşara cavab" [4, s. 368]. Sabirin bu satirası M. H. Zeynalovun 1908-ci ildə "Molla Nəsrəddin" jurnalının 9 mart tarixli 10-cu sayında dərc edilmiş bir şeirinə cavabdır. Şeirin başında yazılan "Şairimiz "Hop-hopa" təqdim olunur" sözləri nəzərə alınmamış və bu əsər səhv olaraq Sabirə isnad ilə ilk dörd nəşrə daxil edilmişdir [4, s. 368]. Sabir "Madam ki, Hamiyani-zülmət" adlı təhzilində "Qızdırmalı"ya cavabında özünəxas bir müdrikliklə bildirir ki, cəmiyyət heç vaxt rəzil qüvvələrdən mübarizəsiz xilas olub xoş günə çıxa bilməyəcək. Hər iki təhzil arasındakı fərqi göstərməklə yanaşı, Sabirin müasirindən ("Qızdırmalı"dan) çox yüksəkdə dayandığını xüsusi olaraq qeyd etməliyik. Sabirin şeiri zahirən nəzirəni yada salsa da, o daha çox təhzildir. "Nəzirədə əsas şeirə həm forma, həm məna cəhətdən təqlidçilik, ona müəyyən dərəcədə tabelik şərtdir. Təhzildə isə əsas şeirin ruhu ilə uzlaşmamaq, ona müxtəlif şəkil və dərəcədə etiraz və ya müxaliflik tələb olunur.

Sabir, Rəcaizadə Mahmud Əkrəmin "Bahardan bir yarpaq", yaxud "Zəmzəmədən bir nəğmə" şeirinə "İftardan bir göftar, ya məcmuədən bir löqmə" ("Atmış niqabi-hüsnin məcmuəyi-təvangər") adlı satirasını nəzirə yazmışdır. Sabirin bənzətməsini A. Səhhət "İftardan bir göftar, ya məcmuədən bir löqmə", Ə.İ. Cəfərzadə isə "Bir vaizi-süxənvər" adlandırmışlar. Hər ikisi, habelə 1948 və 1954-cü illərin nəşrləri də Sabirin bu əsərini tamamilə yanlış olaraq nəzirə sayırlar. Bunların təsiri altında rus dilinə tərcüməsində də Sabirin bu şeiri, nəyə və ya kimə aid olduğu anlaşılmadan "Padrajanie" (nəzirə) başlığı altında çap olunmuşdur. Yaxşı ki, bu yanlışlığı Əziz Şərif tərcümənin "Qeydlər"ində dolayı yolla da olsa, düzəltmişdir. "Bu satira Rəcaizadə Mahmud Əkrəm bəyin "Füyuzat" jurnalının 1907-ci il 7 oktyabr tarixli 29-cu sayında dərc olunan

"Bəhardan bir yapraq, yaxud zümzümədən bir nəğmə" adlı şeirinə bir nəzirədir" [4, s. 362].

*Rəcaizadə Mahmud Əkrəm:*

Atmış niqabi-hüsnün məhbubeyi-zərəfsər,
Qızlar yəşil geyinmiş...açmış bütün çiçəklər,
Ahəngriz gülşən mürğani-eşqpərvər...
Cari səfadə culər...sarı həvayə ənbər...

*Mirzə Ələkbər Sabir:*

Atmış niqabi-hüsnin məcmuəyi-təvangər,
Məcmuədə düzülmüş eyzən xuruş sərasər,
Həsrətkeşani-mətbəx, gürgani-bətnpərvər,
Cari boğaza şərbət, sari-məzaqə şəkkər,
Əksi-buxari-dolma, zilli-əmmameyi-sər,
Dəryayi-iştəhayəolmaqda behcətavər,
Hüzzar içində əsla yox bir fəqirü müztər,
İftar vəqtidir ha, ey vaizi-süxənvər!
İş başbilənsiz olmaz!
Sərsüfrə sənsiz olmaz! [4, s. 138]

Sabirin bu satirası isə ilk dəfə "Molla Nəsrəddin" jurnalının 1907-ci il 11 noyabr tarixli 42-ci sayında imzasız çap olunmuş və bütün nəşrlərə daxil edilmişdir. Üçüncü və dördüncü nəşrdə "Ey vaizi-süxənvər!.." adı ilə, son iki nəşrdə isə sərlövhəsiz verilmişdir. Jurnalda sərlövhədən sonra belə bir qeyd vardır: "Nəzirə ustadi-möhtərəm Əkrəm bəyə..." [4, s. 362].

"Sabir öz nəzirə, bənzətmə və parodiyalarında klassik və müasir şairlərdən formanı alır, bu lirik və ya epik formada satirik məzmunu çox məharətlə ifadə edə bilir. Lakin indiyədək alınan formaya xalq şairinin necə riayət etdiyi göstərilməmişdir. Bunu aydınlaşdırmaq üçün hər iki şeiri müqayisə etmək lazımdır. Müqayisədən bəlli olur ki, hər iki şeir eyni vəzndədir: *məf'Ulü, fA'ilAtün, məf'Ulü, fA'ilAtün* (müzari bəhrinin ikinci növü), şəkilcə də hər ikisi eynidir – cütmüstəzadlı səkkizlikdir. Hər ikisi dörd bənddən ibarətdir. Hər ikisində 8 misradan sonra qısa bir beyt verilir. Bu şeirlərin qafiyə quruluşu da eynidir" [2, s. 45].

Rəcaizadə Mahmud Əkrəm öz sevgilisi ilə romantik hisslərlə yaşamaq istəyən, təbi-

ətin gözəlliyindən zövq alan, çəmənlərin, çiçəklərin görkəmində, quşların nəğməsində, buludların, dağların rəngində öz eşqindən bir zərrə görən, bütün dünyanı eşq içində təsəvvür edən sentimental bir aşiqin öz "dilbəri-səmənbərinə" yetişmək üçün ürəyindən keçən arzularını nəzərə almışdır. Şeir sonadək bu ruhda davam edir. Heç təsadüfi deyil ki, bu ruhu təmsil edən bir misra "Könlüm də sənsiz olmaz!" bütün bəndlərin sonunda gələrək fikri tamamlayır. Rəcaizadədən ancaq forma və parodiya şəklinə düşmüş bəzi söz və ifadələr qalmış olur. Burada sentimental-romantik şeirdən əsər-əlamət belə yoxdur, burjua-mülkədar quruluşundakı ictimai bərabərsizliyi nifrətlə damğalayan realist və ifşaedici satira vardır. Bu satiradakı ictimai həyat mənzərəsi o qədər acınacaqlıdır ki, şair onu ürək yanğısız deyə bilmir. Başqa parodiyalarında olduğu kimi, burada da Sabir parodiya yazdığı şairə nəzakətlə yanaşır. O, "Molla Nəsrəddin" jurnalında çap etdiyi bu məşhur parodiyasında sosial ziddiyyətləri əks edən yeni bir şeir yaratmışdı. Bu parodiya Sabirin realist ədəbi-estetik mövqeyini aydın şəkildə ifadə edən digər şeirləri ilə yaxından səsləşirdi. Lakin nədənsə Sabirin bu şeiri də uzun müddət "Hophopnamə"lərə (son akademik nəşrə qədər) nəzirə adı ilə daxil edilmişdir. Əsl həqiqətdə isə Sabir şeiri Rəcaizadənin şeirinə nəzirə yox, parodiya olaraq yazmışdır. Əkrəm Cəfərin qeyd etdiyi kimi, "Sabirin şeiri ona qarşı (yəni Rəcaizadənin şeirinə qarşı – T. N.) acı-acı rişxəndlər, tənəli istehzalar, şiddətli töhmətlərlə dolu bir xitabdır" [1, s. 17].

*Rəcaizadə Mahmud Əkrəm:*

Etdikcə bən tamaşa həngameyi-bahari,
Məsturi-dudi-sevda ətrafi-guhsari,
Gördükcə pürsükunət dəryayi-biqərari,
Bir sövq ilə olur dil şerin həvəsgüzari.

*Mirzə Ələkbər Sabir:*

Etdikcə mən tamaşa, gördükcə işbu kari-
Acizdə inkisari, saildə iztirari,
Miskində intizari, tacirdə ehtikari,
Əşkim olur gözümdən xuni-ciyərlə cari...

Müqayisəyə nəzər salsaq görərik ki, Rəcaizadə şeirlərini gözələ, Sabir isə yoxsullara xitabən yazmışlar. Rəcaizadənin şeirində mündəricə ünsürləri: günəş, çəmən, çiçəklər, quşlar, arxlar, buludlar, dağlar, dəniz, bahar, eşq, hicran, ilham, canandır. Nəticə etibarilə bunlar bilavasitə heç bir ictimai ideyaya xidmət etmir. Sabirin

şeirində mündəricə ünsürləri: varlı və onun evi, iftar ziyafəti, süfrədə hər növ yeməklər, onun dövrəsində əmmaməli tüfeylilər, yekəqarın sərvətlilər, baş yerdə ruhanilərin böyüyü (vaizi-süxənvər) – bütün bu nazü-nemət bir tərəfdə, bu iki səhnəyə tamaşa etdikcə əzab, iztirab içində hıçqırıqlarla boğulur, göz yaşlarını ciyərinin qanı ilə axıdır. Sabirin bu şeiri Rəcaizadənin şeirinə, "Hophopnamə" tərtibçilərinin dediyi kimi, nəzirə deyil, ona qarşı acı rişxənd, tənəli istehza, şiddətli töhmətlərlə dolu bir xitabdır.

3. Rəcaizadənin əsərlərindən Sabirin guya nəzirə yazdığı bir şeiri də, Ə.İ.Cəfərzadənin dediyinə görə, "Ey sözləri xəyalımı təltif edən mələk" misrası ilə başlayan şeiridir. Ə. Cəfər bunu qəbul etmir. O bildirir ki, Rəcaizadə bu şeirini oğlu Nijad Əkrəm üçün yazmışdır. Sabirin guya buna bənzətməsini "Hophopnamə" nəşrlərində gah "Dilbər", gah "Çocuq" adlandırmışlar. Bu iki şeir arasında məzmunca da ciddi fərqlər var.

1. Rəcaizadənin şeiri şəkilcə mətləsiz altılıq (müsəddəs) ikən, Sabirin şeiri şəkilcə mətləli altılıqdır.
2. Rəcaizadənin şeiri altılıq şəklinin müsəmmət tiplisidir, yəni bunun hər bəndinin altıncı misrası eyni qafiyə və rədiflə bağlanır, Sabirin şeiri isə müsəmmət deyil, nəqəratlı altılıqdır.
3. Rəcaizadədə qafiyələr birinci bənddə *aabvvb*, qalan bəndlərdə *aaaaab* şəklində ikən, Sabirdə mətlədən sonra bütün bəndlərin qafiyələri *aaaabb* şəklindədir.

Bu izahatdan açıq görünür ki, Ə. İ. Cəfərzadə Rəcaizadənin şeirindən üç misranı alaraq Sabirin şeirinin üstünə qoymaqda da, böyük şairin şeirini ona nəzirə adlandırmaqda da səhv etmişdir. "Hophopnamə"nin 1948-ci və 1954-cü il nəşrlərində isə Sabirin bu şeirinin Rəcaizadəyə deyil, Məhəmməd Hadiyə nəzirə olduğu göstərilir.

Beləliklə, parodiya yazarkən şair lirik romantik şeirin poetik vasitələrini tamam yeni, daha kəskin sosial problematikanın ifadəsinə uyğunlaşdırmışdır. Ümumiyyətlə, Sabirin Füzuli, Namiq Kamal, Abdulla Cövdət, Mahmud Əkrəm və başqa türk şairlərinə yazdığı parodiyalar bu janrın ədəbiyyatımızda yaranmış klassik nümunələridir.

**Nəticə**

Rəcaizadənin lirik romantizminə Sabir satirik realizmlə cavab vermişdir. Bunu məqalədə müqayisələr aparmaqla görmək mümkündür. Sabir Rəcaizadədən götürdüyü bütün nümunələri işləyərkən onun mühüm əlamətlərini mühafizə etməklə bərabər, onların üzərində ciddi dəyişikliklər də etmişdir. Rəcaizadə yaradıcılığında gördüyümüz kədərli motivləri satirik üsluba tətbiq edərək gülüş doğuran bir kədər yaratmışdır. Təbii ki, bu metod Sabir novatorluğunda xüsusi çəkiyə malikdir. Sabirin də nəzirə prinsipi

məhz bu istiqamətdə idi – tərs mənada nəzirədən istifadə edərək orijinal satirik əsər üzə çıxarmaq.

**Ədəbiyyat**


1. Cəfər, Ə. (1962). Sabirin yaradıcılığında təhzil, nəzirə və bənzətmələr. *Azərb. SSR. EA-nın xəbərləri, ictimai elmlər seriyası,* 5.
2. Əli, A. (1999). *M. Ə. Sabirin satira sənətkarlığı*.
3. Əlimirzəyev, X. (2009). *Klassiklərimizin ideal və poetik sənət dünyası*. II cild. Elm və təhsil.
4. *Hophopnamə.* (2004). I cild. Şərq-Qərb.
5. Xəndan, C. (1962). *Sabir yaradıcılığının sənətkarlıq xüsusiyyətləri.* Azərbaycan Dövlət Nəşriyyatı.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 91–98
https://doi.org/10.48445/s2399-3800-3773-v

# Azərbaycan dilində əlavə konstruksiyaların qrammatik-struktur cəhətdən tədqiqi

***Rəfanə İsayeva*** [1]

**XÜLASƏ**

*Əlavə cümlələr bu və ya digər halda əsas söyləmlə, fikirlə məntiqi-semantik əlaqədə olur. Onu da qeyd etmək lazımdır ki, mətndə, canlı danışıq dilində və onun ədəbi yazılı formasında cümlənin əsas məzmunu, mətnin konteksti ilə bağlı olmayan, hər hansı mövcud vəziyyətdə meydana çıxan ekstralinqvistik cümlələrə tez-tez rast gəlmək mümkündür. Onlar cümlənin əsas məzmunu ilə əlaqələnməsə də, söyləmlə leksik-semantik cəhətdən əlaqələnərək vahid fikir yarada bilir. Müəllif hər hansı bir informasiyanı ötürməyə hazırlaşarkən, onu özlüyündə əsas, vacib, əlavə, ikinci dərəcəli, artıq məlum olan və ya yeni fikir kimi ayırır. Bütün bunlar isə, öz növbəsində, sadə, mürəkkəb cümlələrin və mürəkkəb sintaktik bütövlərin struktur-qrammatik quruluşunda özünü göstərir.*

**AÇAR SÖZLƏR**

*əlavə konstruksiyalar, nitq hissələri, söz, cümlə, söz birləşməsi*

**MƏQALƏ TARİXÇƏSİ**

Göndərilib: 13.11.2024
Qəbul edilib: 18.02.2025

[1] Müəllim, Azərbaycan Dillər Universiteti. Azərbaycan.
https://orcid.org/0000-0003-2668-5602 | refane_isayeva@yahoo.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 1 / 91–98
https://doi.org/10.48445/s2399-3800-3773-v

# Additional Constructions in the Azerbaijani Language Grammatical-Structural Inference Study

***Rafana Isayeva*** [1]

**ABSTRACT**
*Additional sentences in this or another way establish a logical-semantic connection with the main statements or ideas. It should also be noted that in the text, whether in live spoken language or in its literary written form, it is often possible to encounter extralinguistic sentences that arise solely due to current circumstances. Although these types of sentences do not relate to the main content of the sentence, they can create a unified idea based on lexical-semantic aspects. When preparing to convey any information, the author distinguishes it in terms of primary, important, additional, secondary, already known, or new ideas. All of these, in turn, manifest themselves in the structure-grammatical construction of both simple and complex sentences and complex syntactic structures.*

**KEYWORDS**
*parantesic constructions, part of speech, word, sentence, word combination*

**ARTICLE HISTORY**
Received: 13.11.2024
Accepted: 18.02.2025

[1] Teacher, Azerbaijan University of Languages, Azerbaijan.
https://orcid.org/0000-0003-2668-5602 | refane_isayeva@yahoo.com

## Giriş

XX əsrin ortalarından etibarən, Azərbaycan dilçiliyində sintaksisin problemləri struktur, konstruktiv, semantik, praqmatik, formal və funksional aspektlərdən dilçilər tərəfindən öyrənilməyə başlanılmışdı. Bildiyimiz kimi, fonetikadan, leksikadan, morfologiyadan fərqli olaraq, sintaksis elmi dildə hazır şəkildə olmayan, nitq-danışıq aktında hər dəfə yenidən qurulan konstruktiv vahidlərdən ibarətdir. Müasir bədii, elmi, publisistik mətnlər struktur-sintaktik baxımdan müxtəlif konstruksiyalardan qurulur. Sintaktik konstruksiya – sözlərdən, söz birləşmələri və cümlələrdən ibarət qrammatik cəhətdən birləşmiş bütövlərdir. Mətndə ən çox istifadə olunan sintaktik konstruksiyalardan biri də *əlavə konstruksiyalardır*.

Əlavə konstruksiyalar səs, hərf və ya heca, sözdə buraxılmış ilkin məna, epenteza, sual və nida işarələri, sözlər, sintaktik vahidlər, söz birləşməsi, cümlə, əsas söyləmin tərkibində olan mətn əmələ gətirən fraqmentlər, müstəqil cümlələr arasında olan sintaktik konstruksiyalar ola bilər.

Elmi ədəbiyyatlarda, müasir Azərbaycan dilinin qrammatikasında mühüm yer tutan əlavə konstruksiyalarla bağlı ümumi qənaət budur ki, onlar əsas cümlədə ifadə olunan fikrə qarşı müxtəlif münasibətlər ifadə etmək məqsədilə işlədilir, cümlənin mənasına təsir edə bilir. Bu cür konstruksiyalar vasitəsilə söyləmə əlavə qeydlər edilir, onların köməyi ilə müəyyən dəqiqləşdirmələr, aydınlaşdırmalar aparılır. Bu konstruksiyalar əsas cümlədəki müəyyən fikrə, ifadəyə, cümləyə aid olur, həmin söz, ifadə və ya cümlənin yanında işlənir.

## Əsas hissə

### Əlavə konstruksiyaların quruluşu

Qeyd etmək lazımdır ki, əlavə konstruksiyalar müxtəlif quruluşda olur. Yuxarıda qeyd etdiyimiz kimi, qrammatik-struktur xüsusiyyəti deyərkən, əvvəlcə, əlavə konstruksiyaların hansı nitq hissəsinə aid olmasından, struktur xüsusiyyəti deyərkən, əlavə konstruksiyaların morfoloji quruluşundan söz açmaq lazımdır. Məlum olduğu kimi, morfologiyada əsas nitq hissələrinin quruluşu sadə, düzəltmə və mürəkkəb struktura malikdir. Lakin bu bölgünü yalnız əsas nitq hissələrinə şamil etmək mümkündür. Əlavə konstruksiyaların quruluşundan danışarkən, bu mövqedə çıxış edən hər bir sözün həmin mövqedəki qrammatik formasına diqqət yetirmək lazımdır. Burada onların mötərizə daxilində bir sözdən, söz birləşməsindən, cümlə növündən asılı olaraq quruluşunu müəyyən etmək olar. Yuxarıda əlavə rolunda çıxış edən nitq hissələrini nəzərdən keçirdik. Fikrimizcə, burada quruluş məsələsi əlavə konstruksiya mövqeyində

çıxış edən sözlərdən, söz birləşmələrindən və mürəkkəb cümlələrdən asılı olaraq müəyyən olunmalıdır.

**Bir sözdən ibarət olan əlavə konstruksiyalar**

Əlavə konstruksiyaların ən geniş yayılmış növü *əlavə sözlərdir*. Əlavə sözlər əksər hallarda ara sözlərlə qarışıq salınır. Lakin haqqında bəhs etdiyimiz konstruksiyaların oxşar və fərqli cəhətləri vardır.

*Oxşar cəhətləri:*

– cümlənin əsas hissəsinə deyil, əlavə hissəsinə aid olurlar;
– bir və ya bir neçə sözdən ibarət olurlar;
– cümlə üzvləri ilə qrammatik cəhətdən əlaqələnə bilmirlər;
– yazıda durğu işarələri vasitəsilə əsas cümlə üzvlərindən ayrılırlar.

*Fərqli cəhətləri:*

– ara sözlər modallıq bildirir, əlavə sözlər isə modallıq bildirmir;
– ara sözlərin xüsusi ifadə vasitələri (nitq hissələri) var, əlavə sözlərin isə konkret ifadə vasitələri yoxdur;
– ara sözlər cümləyə məna çaları qatır, əlavə sözlərin isə belə bir funksiyası yoxdur;
– ara sözləri cümlənin tərkibindən çıxararkən mənası dəyişə bilər, əlavə sözləri isə cümlənin tərkibindən çıxararkən məna dəyişmir.
– ara sözlər ən çox 3 – 4 sözdən, əlavə sözlər isə daha çox sözdən ibarət olur.

Nümunələrə nəzər salaq:

***Bəlkə**, bu axşam yağış ara verdi; **Gərək**, sinə gərək düşmənə əlbir; **Əlbəttə**, onun əl çantasını açmaq heç kimin ağlına gəlməyəcəkdi; Qoşunun gələcək fərmandehləri (komandirləri) mənim dərsimə diqqətlə qulaq asırlar* [7, s. 208]; *Oynayan oğlan (mütrüb) və qızlar (çəngi) çağrılardı. Mütrübləri İraqdan, çəngiləri isə Tiflisdən gətirərdilər* [9, s. 33]; *Daş körpü və Tamojna körpüsündə odun, kömür və şəhər küçələrinə döşənmək üçün gətirilən çay daşları (qənbər) boşaldılırdı* [6, s. 102]; *Nadir şah tərəfindən salınmış yeni Şamaxının (Ağsu) əhalisini də köhnə Şamaxıya qaytarır* [6, s. 44].

Yuxarıda göstərdiyimiz ilk üç cümlədə fərqləndirilmiş hissələr ara sözlər, digər dörd cümlədə isə əlavə sözlər verilmişdir. Söz formasında olan əlavə konstruksiyalar Azərbaycan dilində xüsusilə çox işlənir.

**Söz birləşmələrindən ibarət olan əlavə konstruksiyalar**

Bu konstruksiyalar müvafiq olaraq, iki və daha artıq sözdən ibarət olur. Diqqətə çatdırmaq istərdik ki, iki və daha artıq sözdən ibarət əlavə konstruksiyalar dedikdə, əsasən, söz birləşmələri (həm ismi, həm feili, həm də zərf birləşmələri olmaqla),

qoşmalı birləşmələr nəzərdə tutulur. İki sözdən ibarət sadə birləşmələrdən başlayaraq, bir neçə sözdən ibarət çoxsözlü mürəkkəb birləşmələr olmaqla, söz birləşmələrindən ibarət əlavə konstruksiyalar bədii nitqin bir çox formalarında özünü göstərir. Söz birləşməsindən ibarət əlavə konstruksiyalarla – əlavə birləşmələrlə əlaqədar nümunələri nəzərdən keçirək.

*Məhz bir ölkədə, bir darül-elmdə (elm ocağında) birləşməmişdi* [8, s. 272]; *Blastoma... (xərçəng xəstəliyinin bir növü) qara ciyərində. Feldşer özünü dartdı* [8, s. 312]; *Borisin (bölük müdiri) atları necədir?* [16, s. 157]; *Düzdür, saatsaz Gülağa ilə arvadı Sona da (mənim anamın adaşı) bizim məhəllədə yaşayırdı* [10, s. 56 ]; *Nazirliyə (Maliyyə nazirliyi olan bina) çatanda gördük ki, tünlükdür, çoxlu silahlı adam var* [9, s. 241]; *Mən anamın xatirinə (həm də ac olduğum üçün!) tısbağa yumurtasının tozundan su ilə bişirilmiş, yağsız horra kimi bir şeyi yeyirdim* [3, s. 153]; *Bu stansiyanın işinə bir hərbi brandvaxt (limanda saxlanılan keşikçi gəmisi) başçılıq edirdi* [11, s. 87]; *Bu Səlimədir, Səlimin həyat yoldaşı (Səlim dedikdə "tipi" göstərdi). Oturun, tanış olun...* [9, s. 252].

Yuxarıda söz birləşməsi formasında verilən əlavə konstruksiyalara aid nümunələrdə sadə və mürəkkəb söz birləşmələrinə, ismi, feili və zərf birləşmələrinə rast gəlinir. Buradan belə nəticəyə gəlinir ki, söz birləşmələrinin əlavə konstruksiya kimi çıxış etməsində heç bir məhdudiyyət yoxdur.

**Cümlə formasında olan əlavə konstruksiyalar**

Əvvəlcə onu qeyd etmək lazımdır ki, cümlə növlərinin əlavə konstruksiya mövqeyində çıxış etməsinə məhdudiyyət qoyulmur. Cümlənin funksional cəhətlərinə görə bölünən dörd növünün hər birinə aid nümunələrə əlavə konstruksiya qismində rast gəlmək mümkündür. Bundan əlavə, bəzi nümunələrdə bir əlavə konstruksiya daxilində bütün cümlə növləri özünü göstərir: – *Mənim sözüm kifayət deyil, Ələkbər?* (*Əleykümə salam, kişi qırığı! Necəyəm? Hər işim qaydasındadı. Bircə bəzmi-Süleymanım çatışmır!.. Bilirsən də, Ələkbər, sənin adaşın Mirzə Ələkbər əhli-qələm olub!.. O kişi deyib ki, qoca-müstəğniyi-sərvət də olsa, qolunda bir cocuqca qüvvət olmaz! Başa düşdün? Allah Mirzə Ələkbərə rəhmət eləsün, bilib ki, nə deyir!.. Allah Mirzə Səttara da rəhmət eləsün, Sabirin dəlisi idi, şeirləri dilindən düşmürdü... Çünki elə özü də Sabir kimi xalqını sevən adam idi...)* [7, s. 196].

Qeyd edək ki, nitqimizdə olduğu kimi, əlavə konstruksiya mövqeyində çıxış edən cümlələr arasında nəqli cümlələr nisbətən geniş şəkildə yayılmışdır. Məsələn: *Bayram etməyi qərara alırlar (1918-ci ildə may ayının 25-də Tiflisdə Zaqafqaziya Seymi Gürcüstan, Azərbaycan və Ermənistan respublikalarının "azadlığını" elan etmişdi.). Müsavat hökuməti bu bayrama böyük ümid bəsləyir və güman edirdi ki, bolşeviklər*

*razılaşmayacaq, bayramı boykot edəcəklər, bu yolla da müsəlman əhalisi arasında özlərini ifşa edib, nüfuzdan düşəcəklər* [13, s. 177]; *O illərdə, yəni 1900-cu illərdə Bakı fəhləsinin əsas tərkibini yerli azərbaycanlılar (bunların da əksəriyyəti Bakı kəndlərindən idi)*, *həmşərilər (o zaman Cənubi Azərbaycandan işləməyə gəlmiş adamları belə adlandırırdılar)*, *ləzgilər, ruslar və tatarlar təşkil edirdi* [11, s. 118]; *Yazıq Ələkbər böyük oğlunun boy-buxununa (Bəhmən atası kimi şaqqalı, ucaboylu idi.) baxıb qürurla deyirdi* [6, s. 259]; *Şəxsən tanıdığı (iki-üç dəfə məntəqəyə gəlmişdi, keçmiş direktorla bir məclisdə oturmuş, yeyib-içmişdilər.) nazir Ələmdar Qədirovun yanına getmişdi və dərdini açıb demişdi* [11, s. 266].

Məqsəd və intonasiya baxımından sual cümlələri kimi müəyyən edilmiş cümlələr əlavə konstruksiya mövqeyində çıxış edir. Nümunələrə nəzər salaq:

1. *Özü də sadə idi, geyimi də. Yəqin Afət də başqa qızlar kimi gözəl geyinməyi xoşlayırdı (Qız ola, gözəl geyinməyi xoşlamaya?!). Ancaq hardan geyinəydi*?! [11, s. 277]

2. *Televizorun (ya o zaman televizorlar olmayacaq, qoloqraflar olacaq, kim bilir?) axşam proqramı haqqında sabahkı işləri düşünəcək* [6, s. 319].

3. *İbadulla Cəfərqulunun nə dediyini başa düşmədi (ya mənə belə gəldi?) və yenə də həmin kal və xırıltılı səsi ilə araq iyi verə-verə dedi* [7, s. 166 ].

4. *Mən asta addımlarla gəlib o qarının qabağında dayandım, hələ uzaqdan görən kimi tanıdığım o qarını salamladım (yoxsa o salamı özüm verdim?)* [7, s. 185].

5. *Sonra da Bakıda, bizdə bir köhnə dost-aşnaynan yığışaq, armudu stəkanlarda bir yaxşı məxməri çay içək, bir nərd ataq (Nərd oynamağı unutmamısınız ki?). Yeri gəlmişkən, bildir Yəhyayla Sizə bir nərdtaxta göndərmişdim* [12, s. 61].

6. *Cənab Ağdamski də (nə vaxt Ağdamlı olacaqdır?) Sarablı düşən dərdə mübtəla olubdur* [13, s. 390]. Yuxarıda göstərdiyimiz nümunələrdən belə nəticəyə gəlmək olur ki, sual cümlələri əlavə cümlə qismində geniş şəkildə iştirak edir.

Əmr-təhrik cümlələrinin əlavə konstruksiya mövqeyində çıxış etməsi də kifayət qədər müşahidə olunur. Məsələn: *Məhəllənin kişiləri Şövkəti öldürməsələr də (evdə qardaşı, ya atası yox idi ki, Şövkəti öldürsün), hər halda məhəllədən qovacaqlar* [7, s. 79]; *Qriqori Maksimiç (biz də bunu belə adlandıraq) razılıq edib çıxdı* [13, s. 262]; *Qalın paltar bunları pis göstərir: qış paltosu dizəcən, "ayaqlar" böyük qaloşda, üzləri çox vaxt vual ilə örtülmüş, əlləri "fırtılıq mitkaçığında"...* (*Barışnalar məni əfv etsinlər! Burunların silib yaylıqlarını gizlədən şeyi rusca unutmuşam. Ona görə özümdən ad tapdım)* [13, s. 352].

Nida cümlələri də əlavə konstruksiyalar mövqeyində çıxış edir. Nümunələrə nəzər salaq: *Rəhmətlik xanın mənimlə arası çox kök idi (indi kök olmasın!)* [13, s. 39]; *Qori*

*seminariyasında müsəlman şöbəsinə məşhur qeyrətli, həmiyyətli mühərrilərimizdən Soltan Məcid Qənizadəni inspektor təyin etdi (bu, dövlət tərəfindən heç görünməyən, gözlənilməyən hərəkət!), axırda seminariyanın, Qori seminariyasının bir qeyri müsəlman şəhərinə köçmək məsələsini araya gətirdi* [13, s. 28]; *Əliabbas kişini kəndə, öz yanlarına apara bilmirdilər (Mələksiz bir gün də yaşaya bilmərəm mən!..) və həftədə bir dəfə, iki dəfə şəhərətrafı qatara – "elektriçkaya" minib gedirdilər* [4, s. 105]; *Mollanın dediyindən çıxmamışam; öl deyib ölmüşəm, ayıb olmasın, ev adamına İbni Mülcəm (allah lənət eləsin!) ölən axşamı yaxşı kəlləpaça bişirdib aparmışam, yeyiblər (halal xoşları olsun!), bəs mənim günahım nədir?* [10, s. 54]; *Qüssə dolu, amma eyni zamanda birdən-birə işıldayan gözləri ilə o, yad arvadların dalınca baxırdı (məhəlləmizin qız-gəlini yanımızdan ötəndə Balakərim heç vaxt başını qaldırmazdı!), bir-iki dəfə udqunurdu* [5, s. 151]; *Biz məhəllədən köçəndə on – on bir yaşım var idi və yəqin qırx ildi ki, ayağım bu küçəyə dəymirdi (bu da mənim etibarım!..) və hərgah küçənin yaddaşı varsa, nəyisə də unudur* [5, s. 182].

Cümlə hökmdür, bitmiş fikir ifadə edir, eyni zamanda informasiya ötürmək üçün məzmun bütövlüyünə malik olan kommunikativ vahiddir. Cümlənin bu xüsusiyyəti onun quruluşundan asılı deyildir. Bu, əlavə konstruksiyalarla zənginləşən cümlələrə də aiddir. Bütün cümlə növləri kimi, əlavə cümlələr də bitmiş fikir ifadə edir.

**Nəticə**

Bir qayda olaraq, mətndə əlavə cümlələr kimi çıxış edən konstruksiyalarda kommunikasiya materialı aşağıdakı kimi qurulur: vacib olan məlumat cümlənin əsas hissəsində verilir, əsas məzmunla və ya hər hansı komponentlə bağlı olan əlavə məlumatlar isə əlavə cümlələrdə verilir. Əlavə cümlələr heç də həmişə ikinci dərəcəli məlumat ötürmək üçün istifadə olunmur. Əksər hallarda, müəllif məqsədli şəkildə əlavə xüsusiyyət daşımasına baxmayaraq, daha əhəmiyyətli olan məlumatı oxucunun (dinləyicinin) diqqətini cəlb etmək üçün əlavə cümlə şəklində verərək onu daha da aktuallaşdırır. Cümlənin komponentlərindən hər hansı birinin aktuallaşdırılması cümlənin əsas tərkibindəki tabelilik əlaqəsinin pozulmasına səbəb ola bilər ki, bu da, öz növbəsində, həmin komponentin bu mülahizə çərçivəsində məna və intonasiya müstəqilliyinin artmasına və əlavə vahidə çevrilməsinə gətirib çıxarar. Bu komponentin intonasiya və mövqe cəhətdən xüsusiləşməsi onun cümlənin əsas tərkibi ilə əlaqə xüsusiyyətinin dəyişməsinə səbəb olur.

**Ədəbiyyat**


1. Abdullayev, K., Məmmədov, A., Musayev, M. və başqaları. (2012). *Azərbaycan dilində mürəkkəb sintaktik bütövlər* (dərs vəsaiti). Mütərcim.
2. Nərimanov, N. (2004). *Seçilmiş əsərləri*. "Lider" nəşriyyatı.
3. Sabit, R. (2004). *Seçilmiş əsərləri*. 2 cilddə, II cild. Avrasiya Press.
4. Süleymanlı, M. (2004). *Üç roman*. "Azərbaycan" nəşriyyatı.
5. Süleymanlı, M. (2006). *Seçilmiş əsərləri*. Şərq-Qərb.
6. Abbaszadə, H. (2006). *Seçilmiş əsərləri*. 2 cilddə, I cild.
7. Elçin. (2005). *Seçilmiş əsərləri*. 2 cilddə, II cild. Avrasiya Press.
8. İbrahimov, M. Ə. (2005). *Seçilmiş əsərləri*. 2 cilddə, II cild. Şərq-Qərb.
9. İsa, M. (Hüseynov). (2005). *İdeal.* "Lider" nəşriyyatı.
10. Cəlal, M. (1967). *Seçilmiş əsərləri*. 4 cilddə, II cild. "Gənclik" nəşriyyatı.
11. Qılman İ. (2006). *Bakı və bakılılar* (üçüncü nəşri). "Nurlar" nəşriyyat-Poliqrafiya Mərkəzi.
12. Anar. (2004). *Seçilmiş əsərləri*. "Lider" nəşriyyatı.
13. Nərimanov, N. (2004). *Seçilmiş əsərləri*. "Lider" nəşriyyatı.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 1 / 99–113
https://doi.org/10.48445/i2329-9068-3091-z

# "Füyuzat" jurnalında ana dili məsələsi

***Türkan Məcidova*** [1]

**XÜLASƏ**
*Bir millətin ömrü adi bir insan ömrünə bənzəyir. Bir xalqın ədəbiyyatının da ömrü elə adi bir insan həyatına oxşayır. Necə ki, insan ömür sürüb yaşa dolduqca kamilləşir, səhvlərindən, doğrularından nəticə çıxararaq yüksəlirsə, ədəbiyyat da kiçik addımlarla irəliləyərək kamilləşir, yüksəlir. Məhz XX əsr Azərbaycan ədəbiyyatını həmin "kamilləşmə mərhələsi" hesab edə bilərik. Bu əsr digər sahələrdə olduğu kimi, ədəbiyyatın da çiçəkləndiyi, yeni inkişaf yoluna qədəm qoyduğu bir mərhələdir. Bildiyimiz kimi, aktuallığını itirməyən mövzulardan biri də ana dili ilə bağlıdır. Ədəbiyyatda ana dili məsələsini araşdırarkən "Füyuzat" jurnalında fəaliyyət göstərən şairlərin yaradıcılığına nəzər salmaq lazımdır. Jurnal həm ideya istiqaməti, həm də dil özünəməxsusluğu ilə ədəbi fikir tariximizdə müstəsna əhəmiyyətə malikdir. Bu baxımdan, "Füyuzat" jurnalının hərtərəfli araşdırılması daim diqqət mərkəzində saxlanılmalıdır.*

**AÇAR SÖZLƏR**
*"Füyuzat", ana dili, mətbuat dili, milli mətbuat*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 07.12.2024
Qəbul edilib: 02.03.2025

[1] Doktorant, Nizami Gəncəvi adına Milli Azərbaycan Ədəbiyyatı Muzeyi. Azərbaycan.
https://orcid.org/0000-0002-9384-969X | macidova.turkan@mail.ru

*Teaching Of Azerbaijani Language And Literature*
2025 / Volume 71, Issue 1 / 99–113
https://doi.org/10.48445/i2329-9068-3091-z

# The Issue of the Native Language in the Journal "Fuyuzat"

***Turkan Majidova*** [1]

**ABSTRACT**
*The life of a nation is like the life of an ordinary person. The life of a nation's literature is similar to the life of an ordinary person. Just as a person becomes perfect as he grows older and rises by drawing conclusions from his mistakes and truths, literature also improves and rises by progressing in small steps. We can consider the Azerbaijani literature of the 20th century as that stage of improvement. This century is a stage in which our nation flourished in literature as well as in other fields, and stepped on a new path of development. As we know, one of the topics that does not lose its relevance is related to the mother tongue. When examining the issue of mother tongue in literature, it is necessary to take a look at the creativity of the poets active in "Fuyuzat" journal. The journal occupies an exceptional place in the history of our literary thought with both its idea direction and linguistic uniqueness. From this point of view, a thorough investigation of "Fuyuzat" journal should always be in focus.*

**KEYWORDS**
*"Fuyuzat", national press, mother tongue, press language*

**ARTICLE HISTORY**
Received: 07.12.2024
Accepted: 02.03.2025

[1] Ph. D. student, National Museum of Azerbaijan Literature named after Nizami Ganjavi. Azerbaijan.
https://orcid.org/0000-0002-9384-969X | macidova.turkan@mail.ru

 

## Introduction

One of the most complex and contradictory periods in the history of Azerbaijan is the beginning of the 20th century. This complexity and inconsistency is related to the lack of objective investigation of this period from the socio-political and literary-cultural point of view. First of all, it should be taken into account that “at the beginning of the 20th century, Azerbaijani romantics, when they started their activities, mostly turned to the literary experiences of Ottoman Turkey. Because, in this period, there were many similarities between the national ground in Turkey and the national ground in Azerbaijan. Thus, if the feudal despotism of Sultan Abdulhamid and European national colonial pressures ruled Turkey at the end of the 19th century and the beginning of the 20th century, the same feudal lifestyle and colonial policy of tsarism existed in Azerbaijan. It is no coincidence that in the early years of the 20th century, tens of Turkish national movement figures of Azerbaijan, as well as tens of Azerbaijani intellectuals participated in the political and social events of Turkey. It was during this period that the great Turkist of the future, Ali bey Huseynzade, the founder of romantic poetry in Azerbaijan, prominent romantic poets Mahammad Hadi, Huseyn Javid and others were active participants in the socio-political events of this environment, besides studying in Turkey” [1, p. 11]. Of course, in terms of language issues, the linguistic diversity and problems in the “Fuyuzat” journal and a number of periodicals published at the beginning of the 20th century, which we have researched, should be examined on the level of historical reality, which was brought to our attention by the prominent literary critic Islam Aghayev. This opposition, which arose from the hegemony of Ottoman Turkish in the pen of the romantics – “fuyuzatschi”, remained the object of controversy for many years due to the one-sided approach of Soviet literary studies to the problem. Our literary critics, who take the laws of Soviet literature as their basis, have comprehensively studied the “Molla Nasraddin” journal in the sphere of revolutionary-democratic literature, but they have not studied in detail the role played by the “Fuyuzat” journal, which was branded as “bourgeois press”, and other periodicals that are ideologically close to it in the development of Azerbaijani culture. The implementation of these important scientific research works began almost at the end of the 20th century – after the second historic and eternal independence was achieved in 1991. If you pay close attention and look objectively, it is impossible not to see that “Shargi-Rus”, “Hayat”, “Irshad”, “Caspi”, “Taraggi” and other organizations, which had their own place in the world of press, which was dense for the beginning of the 20th century, were ideologically. They can be called “Fuyuzat” and “Fuyuzatists”, because their struggle actions and goals are the same as “Fuyuzatists”.

